# Mündəricat

**ŞƏFAƏT**

**KİTAB HAQQINDA**

Kitabın adı: ŞƏFAƏT

Müəllif: Ayətullah Seyid Həsən Tahiri Xürrəmabadi

Tərcümə edən: Elman Ağamoğlanov

Korrektor: Tofiq Əsədov

NAşIR: Beynəlxalq əl-Mustafa (s) Nəşr və Tərcümə Mərkəzi

Çap tarixi: ۲۰۱۱

Çap növbəsi: Birinci

Tiraj: ۱۰۰۰

ISBN: ۹۷۸-۹۶۴-۱۹۵-۴۰۷-۱



:SATış MəRKəZLəRI

İran, Qum, Şühəda meydanı, Höccətiyyə prospekti, Beynəlxalq əl-Mustafa (s) Nəşr və Tərcümə Mərkəzi. Telfaks: +۹۸ ۲۵۱ ۷۷۳۰۵۱۷

İran, Qum, Məhəmməd Əmin (s) prospekti, Caməətül-ülumun kənarı, Beynəlxalq əl-Mustafa(s) Nəşr və Tərcümə Mərkəzinin satış şöbəsi Tel/Faks: +۹۸۲۵۱ ۲۱۳۳۱۰۶ / +۹۸۲۵۱ ۲۱۳۳۱۴۶

www.miup.ir

www.eshop.miup.ir

E-mail: Admin@miup.ir

NAŞİRDƏN

Hər hansı inkişaf mərhələsini keçən elmi-tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayıb, müəyyən zamanda verdiyi səmərə ilə yekunlaşır. Əlbəttə, bu işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Demək, zaman keçdikcə elm, bilik, hünər əhli onun .toxumlarını becərib-yetişdirir, daim elm və mədəniyyətin cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustəfa (s) Universiteti ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetdik kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq, elmi təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti

məqsəd qoymuşdur. Bununla əlaqədar Beynəlxalq əl-Mustəfa (s) Universitetinin tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən bilir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir guşəsində dini mədəniyyətin çiçəklənməsinin şahidi olaq!

Beynəlxalq əl-Mustəfa (s) Universiteti

Nəşr və Tərcümə Mərkəzi

## MÜNDƏRİCAT

## GİRİŞ

Şiənin etiqadi inancları, Quranda qeyd olunan və məsum imamların sonradan təfsir və şərhləri ilə bəyan olunan islamın əsl üsullarıdır. Quran və hədisdən istifadə edərək, şiə alimlərinin əqli, rəvayi və təfsiri təlaşları bu inanclara xüsusi bir nəzm və qayda .bağışlayaraq, elm və mərifət xəzinəsi yaratmışdır

Şübhəsiz, tövhid şiə inanclarının önündə durur və bu məktəbdə dərin kök salmışdır. Belə ki, şiənin tövhid barəsindəki hədislər toplusuna nəzər salan hər bir kəs, onlardan çox önəmli dərslər öyrənir. Şiələrin birinci imamının "Nəhcül-bəlağə" dəki tövhidi xütbələri, hamını təəccübə gətirmişdir. Məsum imamlardan bizə yetişən dua və minacatlar da, Kumeyl, Əbu Həmzə Somali duaları, Şəbaniyyə minacatları və s... tövhidin saf suyundan faydalanıb, bir olan Allaha bağlılığın doğru yoludur. Şiə .məzhəbinin üsulunda tövhid birinci əsldir və bütün şeylər tövhidlə əlaqələndirilir

Tövhid təlimləri hər bir şiəni, Allahdan qeyrisindən uzaq olmağa və şirkə bulanmaqdan .çəkinməyə vadar edir

Amma çox təəssüf ki, müsəlman firqələrinin içində kök və əsli olmayan vəhhabilik, şiənin tövhidinin xalis olmasında, şəkk və şübhə yaradıb, şəfaət, ziyarət, təvəssül və bu kimi əqidələri şirk əməllər kimi tanıtdıraraq, əsassız iradlar bəyan etmişlər. Şiə alimləri, hətta sünnilərin bəzi insaflı və həqiqət axtaran alimləri bu töhmət və iradlara cavab verərək, qiymətli əsərlər yazmışlar. Bu əsərlərdən biri, bu beş cildli kitabdır ki, onda Ayətullah Seyid Həsən Tahiri Xürrəm Abadi aşağıdakı beş mövzuda, şiənin inanclarını Quran və hədislərdən, həmçinin əhli-sünnənin qədimi və əsl mənbələrindən :istifadə edərək, bəyan etmişdir

.Tövhid və ziyarət .١

.Quranın təhrif olmaması .٢

.Dua və təvəssül .٣

.Təbərrük və qəbirlər .۴

.Şəfaət .۵

Ümid edirik ki, bu kitab, şiə əqaidini tanıtdırmaq üçün irəliləyiş olub, elm və insaf əhlinə .faydalı olsun

## ŞİƏ VƏ ŞƏFAƏT

### İşarə

Vəhhabilik firqəsinin ardıcılları, Peyğəmbər (s) və övliyaların insana şəfaətçi olmalarında, yalnız Allahdan şəfaət istəməyi şərt bilirlər. Peyğəmbər, övliya və .salehlərin hər birindən bir başa şəfaət istəməyi isə, böyük şirk bilirlər

Əlbəttə, açıq və möhkəm dəlilləri olmadıqlarından, daha çox xitabə edib, şüar verirlər. .Bununla belə onların dəlillərini zikr edib, sonra onlara cavab veririk

### Birinci dəlil: Şəfaət Allaha məxsusdur

Onların sözlərindən istifadə olunan məsələlərdən biri budur ki, deyirlər: "Əş-şəfaətu kulluha lillah" şəfaət ümumiyyətlə Allaha məxsusdur.(١) Bu məsələ üçün Quran ayələrinə istinad etmişlər. "Şəfaət Allaha məxsusdur" cümləsindən məqsəd, Allahın bir şəxsin yanında şəfaət etməsi deyil. Çünki Allahdan üstün bir varlıq yoxdur ki, Allah onun yanında şəfaətçi olsun. Onlar deyirlər: Şəfaət onun əlindədir və Allahın icazəsi olmadan heç kəsin şəfaət



---

.Kəşful irtiyab", ٢٠٨" .[١]-١

haqqı yoxdur. Bu cümlə əslində doğrudur. Quran ayələrindən də bu məsələ aydın olur. :Bu şərif ayə kimi

{مَن ذَا الَّذِی یَشْفَعُ عِنْدَهُ إِلاَّ بِإِذْنِهِ}

(Allahın izni olmadan, Onun yanında kim şəfaət edə bilər?”.(۱)“

Onların sözləri budur ki, şəfaət Allahın işidir və buna görə də, belə bir işi Allahdan qeyrisindən tələb etmək şirkdir. Bu söz bir məntiqi müqayisədən qaynaqlanır. Bu müqayisənin birinci mülahizəsi budur: Şəfaət Allaha məxsus işdir. İkinci mülahizəsi isə .”belədir: “Allaha məxsus olan hər bir işi, Allahdan qeyrisindən istəmək şirkdir

Bu arqumentin oxşarına qeyri şəfaətdə də etiqadlıdırlar; Peyğəmbər (s) və imamlar (ə)-dan hacət istəmək kimi və deyirlər: Allaha məxsus işi, Allahdan qeyrisindən .istədiyinə görə müşrikdir

Bu arqumentin aydın olması üçün, əvvəlcə neçə sual açıqlayıb, sonra isə .cavablandırırıq

Birinci sual: Bu dəlilin ikinci mülahizəsindən məqsəd nədir? Əlbəttə, qəbul edirik ki, “şəfaət işi onun əlindədir” və bu məsələ Quran ayələrində açıqca bəyan olunub. Amma ?bu sözləri: “Allahın işini, Allahdan qeyrisindən istəmək şirkdir” nə deməkdir

**Birinci yozum: Qeyri–mümkün işi tələb etmək şirkdir**

Qeyri-mümkün işi bir şəxsdən istəməyin şirk olub-olmaması, Məhəmməd bin Əbdül Vəhhab və digərlərinin sözlərində izah verilmir. Hətta onların sözlərində belə bir icmal və ixtilafın gözə çarpdığını demək olar. Amma onların sözlərinə daha çox diqqət edəndə, bir məsələ ilə



---

.Bəqərə”, ۲۵۵“ . [۱] -۱

qarşılaşırıq ki, bəlkə onunla bu dəlili belə yozub və izah etmək mümkün olsun. Onlar deyirlər: “Allahdan qeyrisinin gücü çatmadığı bir işi, Ondan qeyrisindən istəmək, (şirkdir”.(١)

O yerlərdən biri, “Əlhədiyyətus-sünniyyə” kitabından bir ibarə gətirək. Bu kitab neçə məqalə toplusudur. Onların mötəbər kitablarındandır və ondan çox istifadə edirlər. :Kitabın ikinci məqaləsində deyir

Biz şəfaəti doğru bilirik... . bu formada ki, deyək: “İlahi! Bizim“ :peyğəmbərimizMəhəmməd (s) - i qiyamət günündə bizə şəfaətçi qərar ver”. Ya deyək

İlahi! Saleh bəndələrini və mələklərini bizə şəfaətçi qərar ver”. Belə ki, Allahdan“ istəyək, nəinki onlardan. Belə demək olmaz: Ey Allahın Rəsulu! Ya, ey Allah vəlisi! Mən səndən şəfaət istəyirəm. Ya da digər işlər, (xəstənin şəfası kimi) hansı ki Allahdan qeyrisinin ona qüdrəti yoxdur. Deməli, belə bir hacəti bərzəxdə olan bir kəsdən (istəmək, şirkin qisimlərindən biridir”.(٢)

O, bu ibarəni ki deyir: “deyilməməlidir”- çalışır ki, bir ümumi qayda düzəltsin, şəfaətə və hər bir başqa hacət istəməyə şamil olsun. Dəlili də budur ki, Allahdan başqa heç bir .kəsin qüdrəti yoxdur və belə bir istəmələri şirk sayır

:İkinci yer, həmin kitabın əvvəlinci məqaləsində belə gəlmişdir

Hər bir müsəlmana, qəsdini Allahına tərəf yönəltməsi, Allaha üz tutması, Allaha“ təvəkkül edib və onun bəndəlik haqqını yaxşıca yerinə yetirməsi vacibdir. Belə olduqda, Allahpərəst dünyadan gedərsə, Allah da Peyğəmbərlərini



---

.Kəşful irtiyab”, ٢٠٧-٢٠٨“ . [١] -١

.Həmin . [٢] -٢

onun üçün şəfaətçi qərar verəcək. Bu vəzifəni tərk edib, onun əksini yerinə yetirən, Allahdan qeyrisinə üz tutub, ona təvəkkül edən, Allahdan qeyrisinə ümidli olan və Allahdan qeyrisindən baş verə bilməyən işlərdə, Ondan qeyrisinə pənah aparıb, şəfaət istəyib və ona təvəkkül edən şəxsin əksinə olaraq. Fərq etmir, Peyğəmbər(s)-dən istəsin ya qeyri peyğəmbərdən. Belə istəklər müşriklərin iş və əqidəsidir. Dünyada bütün fitnələr yalnız həmin etiqadlarla yarandı". (١)

Buna əsasən, bir şəxsin Peyğəmbər (s)-in ona şəfaət edəcəyinə ümidi olarsa, halbuki şəfaət Allahın əlindədir, ya onun xəstəsinə şəfa verəcəyinə ümidi olarsa, bu müşriklərin əqidəsi olacaq. Onun dəlili də şəfaət və şəfanın Allah əlində olmasıdır. Xəstənin şəfa tapması barəsində də Qurani- Kərim İbrahim peyğəmbər (s)-in dilindən buyurur:

{وَإِذَا مَرِضْتُ فَهُوَ يَشْفِينِ}

"Xəstələnən vaxt, O (Allah) mənə şəfa verir". (٢)

Beləliklə, bu şəxs Allahdan qeyrisi üçün mümkün olmayan bir işə ümid edib və onu tələb etdiyinə görə, müşrik olmuşdur.

Gördüyünüz kimi, bu ibarətlərdə də, meyarı bu cümlə ilə bəyan edir: yalnız Allah tərəfindən mümkün olan bir işi, Allahdan qeyrisindən istəmək şirkdir.

Başqa bir ibarə, Məhəmməd bin Əbdül-Vəhhabın ərbə qəvaid məqaləsindəki sözüdür ki, Mərhum Əmin, Kəşful-irtiyabda onu nəql etmişdir. O deyir:

"Şəfaət iki qisimdir: Mənfi Şəfaət və müsbət şəfaət. Mənfi şəfaət, Allahdan qeyrisinin gücü çatmadığı işlərdə,

səh:١۶

---

١- [١] . Həmin, s ٢٠٨.

٢- [٢] . "Şüəra", ٨٠.

:Allahdan qeyrisindən istənilən şəfaətdir. Çünki Allah-taala buyurur

Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün“ (gəlməmişdən əvvəl sizə verdiyimiz ruzidən paylayın! Kafirlər isə zülm edənlərdir!”(١).(٢

Bu mübarək ayədə, şəfaət inkar edilmişdir. Məhəmməd bin Əbdül-Vəhhab deyir: “Şəfaət Allahdan qeyrisinin gücü çatmadığı işlərdən olduğuna görə, onu Allahdan :qeyrisindən istəmək olmaz və axirətdə də belə bir şəfaət yoxdur”. Ardınca deyir

Müsbət və doğru şəfaət, insanın Allahdan istədiyi şəfaətdir. Şəfaətçinin şəfaət haqqı“ olduğuna görə əzizlənmişdir. Şəfaətçi o şəxs üçün şəfaət edər ki, Allah onun söz və işindən razı olsun. Şəfaət etməsi də, Allah ona icazə verəndən sonradır, necə ki, Quran (buyurur:” “Allahın izni olmadan, Onun yanında kim şəfaət edə bilər?”.(٣

Gördüyünüz kimi, bu üç ibarənin (hansıki biri də Məhəmməd bin Əbdül-Vəhhabın ;ibarəsidir) eyni məzmunu var, o da budur ki

Şəfaət və Allahdan qeyrisinin edə bilmədiyi hər bir işi, Allahdan qeyrisindən istəmək doğru deyil və şirkdir. Beləliklə, hacət istəmələrin şirk olması və doğru olmaması .barəsində bir ölçü bəyan ediblər

Bu hacət istəmələr, niyə şirkdir? Bu məsələni də açıqlamayıblar. Burada biz onlara kömək etməyə və



---

.Bəqərə”, ٢٥٤“ . [١] -١

.Kəşful irtiyabdan”, nəqlə əsasən, s ٢٠٨“ . [٢] -٢

.Bəqərə”, ٢٥٥“ . [٣] -٣

iddianı yozmağa çalışacağıq. Ona görə də, onların adından bu iddianın yozumunu bu :formada açıqlayırıq

Əgər Allahdan qeyrisinin gücü çatmadığı, yalnız Allahın gücü çatdığı işi, Allahdan qeyrisindən istəsək, bu istək Allahdan qeyrisinin ilahiliyini lazım tutur. Çünki Allahdan qeyrisini və insanı o işə qüdrətli bilmişik. Həqiqətdə onu qadir bilməsəydik, ondan bir şey istəməyin mənası olmazdı. İndiki onu qadir bildik, bu işin Allaha məxsus olmadığına etiqadlı olmuşuq. Həm Allah edə bilər, həm də Zeyd, ona görə də şirkə düçar .olumuşuq

Bu, onların sözlərinin açıqlanmasında, ən uzağı yozula bilən bir yozumdur. Əlbəttə, onlar şəfaət istəməyi, ibadətdə şirkə səbəb olmasına inanırlar, bu baxışla ki, dua istəmək, ibadətdir. Ancaq bizim dediyimizə əsasən, şəfaət istəmək, feldə tövhidin əksinə və feldə şirkə səbəb olacaq, Çünki feldə (işdə) Allah üçün şərik qərar vermişik. .İndi arqumentin əsası aydın olduğuna görə ona cavab verməyə başlayırıq

**Birinci cavab: Şəfaətçi müstəqil deyil**

Dediyiniz bu söz: Allahdan qeyrisinin gücü çatmadığı bir işi, Allahdan qeyrisindən istəmək şirkdir, nə deməkdir? Əgər məqsədiniz belə olsa ki, Allahdan qeyrisinə deyək: Sən bu işi, Allahdan güc almadan və Allah da sənə qüvvə vermədən bizim üçün elə, məsələn həmin şəfaət məsələsində, Peyğəmbər (s)- dən bizə şəfaət etməsini istəyək, Allahın icazəsi ilə isə heç bir işimiz olmasın. Yaxud Peyğəmbər (s) – dən bizim üçün (bu dünyada, ya axirət dünyasında yerinə yetirsin) Allahdan güc və qüvvə almadan, bir işi yerinə yetirməsini istəsək, bu şübhəsiz şirk

olacaq. Peyğəmbər (s) də həmçinin şəfaətə məxsus deyil, bütün işlər də və bütün .şəxslər də, bu cür istək şirkdir

Feldə tövhidin mənası budur. Bu məsələ öz işlərmizdə də belədir. Allah tərəfindən güc və qüvvə verilmədən, bir şeyi götürə bilməyimi düşünsəm, bu şirkdir. Niyə "bihəvlil-lahi və qüvvətihi əqumu və əqudu" deyirik. Yəni mən qalxıram və otururam, amma Onun .güc və qüvvəsi ilə

Hansı müsəlman, peyğəmbərlərdən bu formada hacət istəyir? Biz Peyğəmbər, ya ?İmamdan bir şey və şəfaət istəyəndə, bu etiqadla istəyirikmi

Belə etiqadımız olsa ki, Peyğəmbər (s) Allah ona icazə, qüdrət və güc vermədən, şəfaətə qadirdir. Ya bizim xəstəyə şəfa verər, ya Həzrət Əbül-fəzl (əleyhis-səlam), Allah ona qüdrət vermədən, dua etmədən və Allahdan istəmədən, şəfa verməyə qadirdir, bu şirkdir. Həqiqətən avam bir şəxsdən soruşsaq ki, Həzrət Əbül-fəzl (ə), sənin övladına necə şəfa verir? Şübhəsiz deyəcək: "Allahdan istəyir və Allah şəfa verir" ."və ya mümkündür desin: "Allah ona belə bir qüdrət vermişdir

**İkinci cavab: Səhv bölgü**

Digər mühüm məsələ budur ki, əgər "la yəqdiru ələyhi illəllah" "yalnız Allahın ona qüdrəti çatar" cümləsindəki felə diqqət etsəniz, bunun həqiqətdə fel üçün bölgü olduğunu görərsiz. Çünki bu cümlədəki fel, iki qismə bölünür: Allahdan qeyrisinin gücü .çatmadığı iş və Allahdan qeyrisinin də gücü çatdığı iş

Bu bölgü hansı şərtlədir? "Qüdrəti çatmaz"dan məqsədləri, Allahdan qeyrisinin özü-özündən ona qüdrəti

çatmamasıdırmı? Əgər məqsədləri bu olsa, belə bir bölgü düzgün deyil. Çünki bütün :işlər belədir və heç kəsin özü-özündən heç bir işə qüdrəti yoxdur. Biz etiqadlıyıq

«لا مؤثرفی الوجود الا الله لا مدبر للامور الا الله، لا خالق لشی إلا الله»

Allahdan başqa heç bir təsir qoyan yoxdur, Allahdan başqa işləri tədbirə salan heç_“ .”_kəs yoxdur, Allahdan başqa varlıqlar üçün heç bir xaliq yoxdur

Əslində, məsələnin cövhərinə nəzər salsaq, aləmdə zatən (özü-özündən) qadir olan bir varlıq yoxdur. Mənim vücudum və varlığım ondandır. Yaranmışların hamısı onun kölgəsidirlər. Günəşin qarşısında duran şəxsin kölgəsi də, əgər O, olmasa, kölgə də .”olmaz. Əgər divar olmasa, kölgə də yoxdur. “Əgər bir an naz eləsə, qaliblər sökülərlər

Amma məqsəd bu olsa ki, Allahın işidir, lakin bu qüdrəti bəşərə də vermişdir. Məni yaratmış, mənim bədənim üçün əsəb sistemi, beyin, ruh və nəfs qərar vermişdir. O ruha əmr vermək qüdrətini vermiş ki, əsəb sistemi işə düşür, bir şeyə əl uzadıb və onu götürür ancaq hamısı Allah tərəfindəndir; Əgər Allah bir şəxsə güc və qüdrət versə və o Allahın qüdrət verməsi ilə bir işə qüdrətli olsa, o işi ondan istəmək, niyə şirkdir? Istəmək şirk olarsa onda bizim bir – birmizdən bütün kömək istəmələrimiz şirk olacaq. Məsələn, siz bu xalçanı tək götürə bilərsiz, amma mən götürə bilmərəm. Çünki sizin güclü əsəb sisteminiz və güclü əliniz var. Bu qüdrəti Allah sizə verib, mən sizdən bunu götürüb və bura qoymağınızı istəyirəm, bu şirkdirmi? Qətiyyən şirk deyil, onların özləri .də buna şirk demirlər

Əgər biz Həzrət Məsih (ə) zamanında olsaydıq və Həzrət Məsih (ə) – dan onu müstəqil fail və özü-özündən

ölüləri diriltməyə qadir bilmək əqidəsi ilə, bizim ölümüzü diriltməsini istəsəydik, bu şirk olardı. Amma Həzrət Məsih (ə) – dan belə istəsək (necə ki, istəyirdilər), Çünki Allah :sənə icazə və qüdrət verib və buyurub

{وَتُبرِىءُ الأَكْمَهَ وَالأَبْرَصَ بِإِذْنِى وَإِذْ تُخْرِجُ الْمَوتَى بِإِذْنِى} (١)

Sən Mənim iznimlə anadangəlmə kora və cüzamlı xəstəyə şəfa verir və Mənim“ ”.iznimlə ölüləri dirildirdin

Buna görə mənim bu ölümü dirilt deməyimiz, qətiyyən şirk olmayacaq. Keçmiş tayfalar ki, Peyğəmbərlər (ə)-dan möcüzə istəyirdilər. Onlardan uşaqlarının şəfa tapmasını ya ruzilərinin çoxalmasını istəyirdilər, bu istəmələrin mənası bu olsa ki, “sən müstəqil .formada bu işi et”, bu şirkdir. Amma qətiyyən onların istəmələri bu cür olmamışdır

Beləliklə, cavabın xülasəsi belədir: Əgər biz Allahdan qeyrisindən bir işi istəsək, bu şərtlə ki, onu müstəqil və Allahdan ehtiyacsız fail bilək, bu istək şirkdir, şəfaətə də məxsus deyil və hər bir işdə belədir. Lakin Allahdan qeyrisindən Allahın qüdrəti və Allahın izni ilə bir işi yerinə yetirməsini nəin ki, Allaha ehtiyacı olmadan yerinə .yetirməsini istəsək , bu şirk olmayacaq. Şəfaət də belədir. Deməli, şirk deyil

Yada salınmalı lazım olan mühüm məsələ budur ki, Vəhhabilərin özü və Məhəmməd bin Əbdül-Vəhhab Peyğəmbər (s) - in şəfaət etməsini qəbul edirlər. Deməli, Peyğəmbər (s) şəfaət etməyə qadirdir. Peyğəmbər özü müstəqil formada şəfaət etmir, əksinə Allahın izni ilə şəfaətə qadirdir. Allah istəməsə Peyğəmbər (s) şəfaət edə ,bilməz. Hər halda Peyğəmbər(s) şəfaət etməyə qadirdir



---

.Maidə”, ١١٠“ . [١] -١

ona görə də özləri (Vəhhabilər) də deyirlər: “Peyğəmbər (s) şəfaəti qəbul olunan şəfaətçidir. Allahdan Peyğəmbər(s)-in bizə şəfaət etməsini və Peyğəmbər(s)-i şəfaətci qərar verməsini istəyirik. İndiki Peyğəmbər (s) onun izni, onun qüdrət və gücü ilə şəfaətə qadirdir. Peyğəmbərdən bizə şəfaət etməsini istəyirik. Necə ki, Həzrət İsa(ə)-dan (Allahın izni, onun qüdrət və gücü ilə ölüləri diriltməyə qadir idi) istəyirik ki, bizim .ölümüzü dirilt. Bu ki, şirk deyil

SUAL

Feldə tovhidi nəzərdə tutaraq, Peyğəmbər-Əkrəm (s) bu möcüzəni, ya bu işi yerinə ?yetirdi desək, iradı yoxdurmu

CAVAB

Allahın vasitələrlə yerinə yetirdiyi işi; yəni qüdrətini başqalarına verməsi, bu işi həm Allaha və həm də o vasitələrə nisbət vermək olar. Quranda da görürsünüz ki, Allah :ölüləri diriltmək barəsində buyurur

{هُوَ يُحْيِي وَيُمِيتُ}(١)

Çoxlu ayələrimiz var ki, buyurur: yalnız O dirildir və öldürür. Amma eyni halda, Qurani-kərim həmin diriltməyi Həzrət İsaya (ə) – a nisbət verir. Həmçinin öldürməyi bəzən :özünə nisbət verir və buyurur

{اللَّهُ يَتَوَفَّى الْأَنفُسَ حِينَ مَوْتِهَا}(٢)

{تَوَفَّتْهُ :Eyni halda başqa yerdə həmin öldürməyi mələklərə nisbət verir.(٣) Buyurur Elçilər və Göndərilənlər“ (۴){رُسُلُنَا



---

.Yunus”, ۵۶“ . [١] -١

.Şüəra”, ٨٠“ . [٢] -٢

.Nəhl“, ٢٨ və ٣٢“ . [٣] -٣

.Ən`am”, ۶١“ . [۴] -۴

."onu qəbz ruh edirlər

."Ölüm mələyi sizin canlarnızı alır" (١){يَتَوَفَّاكُم مَّلَكُ الْمَوْتِ} :Ya buyurur

Hər halda vasitələrə bu cür nisbət verməyin iradı yoxdur. Misal üçün, siz əlinizə qələm alıb bir şey yazırsınız. Bu yazını bəzən özünüz yazırsız, bəzən də sizdən yuxarı bir şəxs sizə əmr edib. Ya rəis öz əlaltısına, ya katibəsinə deyir ki, bu məktubu yaz. Burada rəisin məktubu yazmasını da deyə bilərik, halbuki o yazmayıb, lakin məktubun yazılmasına o səbəb olduğuna görə, işi ona nisbət veririk. O faili səbəbdir. Həm də işi yazan şəxsə nisbət verə bilərik ki, bu şəxs məktubu yazıb. Bəzən də nisbəti qələmə verib, deyirik: Bu qələm çox yaxşı yazır. Həmçinin ələ nisbət veririk. Bunların hamısına nisbət veririk - qələm, əl, əmr edən şəxs və yazan, hərəsinin bir çürə dəxaləti var. Ona görə də, işi onların hər birinə nisbət verə bilərik. Hər bir işdə də bu cürdür, işi həm əvvəlinci səbəbə, həm axırıncı səbəbə və həm də ortada olan səbəblərə nisbət .vermək olar

**Məhəmməd bin Əbdül–Vəhhabın yanıltmaları**

Məhəmməd ibn Əbdül-Vəhhab elə bil bu irada diqqət yetirib və "Kəşfuş - şübəhat" .kitabında ona cavab verməyə çalışmışdır

Bu kitabda "şəfaəti Allahdan istəmək lazımdır" deyəndən sonra, belə davam edir: "Əgər bir kəs sizə desə: Allah öz peyğəmbərinə şəfaət izni verib, mən də ondan, Allahın ona bağışladığı şeyi istəyirəm, bunun nə



---

.Səcdə", ١١" .[١]-١

eybi var? Cavab budur ki, bəli Allah Peyğəmbər(s)-ə şəfaət qüdrəti verib, lakin sənə :şəfaət istəməyi qadağan edib, buyurub

(Allahla yanaşı başqa bir kəsi çağırmayın. (Heç bir kəsdən hacət istəməyin.)”.(١),(٢“

Burada, irada düzgün cavab vermək əvəzinə, öz ardıcıllarına, bəhs və cədəl etməyi .öyrədir və deyir bu cür bəhs et

Əlbəttə bu ayəyə istinad, onların sözlərinin bəzisində gözə çarpır ki, onun barəsində bəhs edəcəyik. Amma “Ərbəu – qəvaid” risaləsindən gətirdiyimiz sitatda, arqumentin əsası bu idi: “Allahdan qeyrisinin gücü çatmadığı işi, Allahdan qeyrisindən istəmək olmaz, əks təqdirdə şirkdir”. Qeyd etdiyimiz, məntiqi müqayisə bu idi ki, şəfaətlərin hamısı ona məxsusdur. Şəfaət qüdrəti, şəfaət izni, şəfaət əmri onun əlindədir. Deməli, yalnız Allahın ona qüdrəti var və belə bir şeyi Allahdan qeyrisindən istəmək şirkdir. Bu, onların arqumenti idi. İndi bu irad onlara edilir ki, əgər Allah öz Peyğəmbərinə şəfaət izni və qüdrəti veribsə, ondan şəfaət istəmək də Allahın ona bağışladığı işi istəməkdir və bu şirk olmamalıdır. Bu irada cavab vermək əvəzinə deyir: “Sənə qadağan olunub, .ona görə də istəməməlisən!”. Bu, insanları yanıltmaqdır

**Dəlil müddəanın özüdür**

:İradı aradan qaldırmaq üçün verdiyi cavab budur

Şəfaət qeyri peyğəmbərə də verilmişdir, ona görə də“



---

.Cin”, ١٨“ . [١] -١

.Kəşfuş – şübəhat”, ١۵“ . [٢] -٢

mələklərin və övliyaların şəfaət etmələri doğrudur. Amma görəsən onun mənası budur ki, Allah onlara şəfaət haqqı verib və mən də onlardan şəfaət istəməliyəmmi? Əgər belə bir əqidən olsa, onda salehlərə ibadət etmisən və bu da şirkdir. Hansıki Allah öz kitabında onu bağışlanmayan günah zikr etmişdir. Əgər desən: yox, onda öz sözün batil olacaq ki, deyirdin: Allah ona şəfaət haqqı vermişdir və mən ondan, Allahın ona (verdiyi şeyi istəyirəm”.(١)

Əgər diqqət etsəniz, arqumentin “Dəlil müddəanın özüdür” olmasını görərsiz: Ümumiyyətlə bəhs budur ki, Peyğəmbər(s) və övliyalardan həmçinin mələklərdən şəfaət istəmək şirkdir və ya şirk deyil? O, verdiyi cavabda qətiyyətlə şirk saymışdır. O deyir: Sənin tərəf müqabilin deyərsə: bəli, biz şəfaət istəyirik. Ona de: Sən salehlərə pərəstiş etmisən, hansı ki, Allah onu şirk qərar vermişdir. Bizim bəhsimiz budur ki, şəfaət istəmək, ibadət və pərəstişdir, ya yox? Onlar bunu dəlil kimi qeyd etmişdir ki, şəfaət istəmək ibadət olduğuna görə şirkdir. Halbuki şəfaət istəməyi əslən ibadət .bilmirik. Deməli, onun dəlili müddəanın özüdür

Biz deyirik: Xeyir! Şirk deyil. Allah şəfaəti salehlərə bağışlayıb, necəki Peyğəmbər (s)-ə də bağışlamışdır. Deməli, həm peyğəmbərdən və həm də salehlərdən şəfaət istəmək olar. Dediyi bu söz, ”Salehlərin pərəstişinə düçar olmusan”, bu sözün əvvəlidir və biz .qəbul etmirik. Çünki dəlil müddəanın özü və müddəanı dəlil qərar verməkdir

Biz soruşuruq: Quranın harasında buyurur ki, əgər salehlərdən şəfaət istəsəniz, ona ibadət etmisiz? Hansı



---

.Kəşfuş – şübəhat”, ١٥“ .[١]-١

:təfsirçi bunu demişdir. Siz nəyə əsasən bunu Qurana nisbət verir və deyirsiz

.”Allah öz kitabında onu, bağışlanmayan şirk zikr edib“

Bəli, Allahdan qeyrisinə ibadət, Quranda şirk sayılmışdır. Amma şəfaət istəmək, qətiyyən ibadət deyil, əksinə hacət istəmək və dua etməkdir. Yəni Ey Allahın Rəsulu! Dua edib Allahdan bizim günahlarmızı bağışlamasını istə, bu ibadətdirmi? İbadətin .xüsusiyyətləri vardır və şəfaət istəməkdə o xüsusiyyətlər yoxdur

Əlbəttə, mümkündür desinlər, islamdan qabaq “lat” adında bütə pərəstiş olunmuşdur. Bəli, “lat” Allahın saleh bəndələrindən birinin adıdır ki, camaat onun xatirəsinə bir heykəl düzəltdilər. Yavaş – yavaş bütə çevrildi və adını “lat” qoydular və ona pərəstiş .edirdilər. Əslində o bütə pərəstiş edirdilər, nəinki saleh bəndəni

Amma hər halda, şəfaət istəməyin şəfaətçiyə ibadət olması, bu bəhsin əvvəlidir və heç .cürə qəbul edilən deyil

**Arqumentdə ziddiyyət**

:Bu arqumentin digər bir iradı da var. Çünki bir tərəfdən istinadın əslində deyirlər

Allahdan başqa bir kəsin qadir olmadığı şeyi Allahdan qeyrisindən istəmək, şirkdir. Başqa tərəfdən, qəbul edirlər və aşkarca deyirlər ki, Peyğəmbər (s), övliya (ə) və mələklər, hətta uşaqlar qiyamət günündə şəfaət edərlər. Deməli, şəfaətin mümkün .olması məlum olur, lakin “izinlə mümkün” dür

:Sözlərinin birində bu barədə deyir

Əgər bir şəxs desə:” Sən Allah Rəsulu (s) – in şəfaətini inkar edib və özünü bu“ :əqidədən uzaq bilirsənmi? De

xeyr, mən inkar etmirəm, çünki Peyğəmbər (s) şəfaəti qəbul olan şəfaətçidir və mən (də onun şəfaətinə ümidvaram".(١)

Gördüyünüz kimi, şəfaəti Peyğəmbər (s) üçün mümkün bilir. Hacət istəmək bəhsində deyir: Başqası üçün mümkün olan bir işi istəmək, şirk deyil. Əgər bu iki məsələ, hansı ki, onların öz sözüdür, bir – birinə əlavə olunsa, nəticə bu olur ki, birinci: öz etirafınıza əsasən peyğəmbər (s) şəfaət edər. İkinci: Allahdan qeyrisindən, mümkün işi istəmək, şirk deyil ki, bu da özünüzün etirafınızdır. Nəticədə peyğəmbərdən şəfaət istəmək şirk olmayacaq. Deməli, sizin sözlərinizin arasında, ziddiyyət var. Bir tərəfdən deyirsiz: Şəfaət istəmək şirkdir, Allahdan başqa, heç bir şəxs üçün mümkün deyil. Digər tərəfdən deyirsiz: Şəfaət Peyğəmbər (s) üçün mümkündür və mümkün işi Allahdan .qeyrisindən istəmək şirk deyil. Nəticə də budur ki, şəfaət istəmək, şirk deyil

Əgər məqsədiniz bu olsa ki, şəfaət Peyğəmbər (s) üçün "özü-özündən" mümkün deyil. Peyğəmbər(s) zatən və özündən qadir deyil, bu məsələnin şəfaətə məxsus olmadığını dedik. Heç bir insan və heç bir iş görənin zatən heç bir işə qüdrəti yoxdur. Hər bir iş görən və hər bir insanın vücudu Allahdandır, qüdrəti də ondandır və heç bir kəsin özü-.özündən qüdrəti yoxdur

Allahın iradə və izninə nəzər etmədən, Həzrət İsa (ə) da, ölüləri diriltməyə qadir deyildi. Peyğəmbər (s) də, möcüzələrə qadir deyildi. Biz də öz işlərimizdə beləyik, qadiriksə, Allaın izni, gücü və qüvvəsilədir. Əgər



---

.Həmin, s, ١٥ . [١]-١

məqsədiniz budur ki, şəfaət Peyğəmbər (s) üçün mümkündür, onda özünüz dediyiniz kimi, mümkün işi istəmək şirk deyil. Nəticə alırıq ki, peyğəmbər (s)-dən şəfaət istəmək .şirk deyil

### İkinci yozum: Allahın işlərinə müdaxilə etmək

İndi başqa bir baxışdan məsələyə baxırıq: Yəni onların şəfaət istəməyi, niyə şirk bilmələrini anlamaq üçün, müxtəlif ehtimallar irəli sürüb, hər birini öz yerində analiz .edirik

Ehtimallardan biri budur ki, deyirlər: Şəfaət Allahın haqqıdır və Allahın haqqı olduğuna görə, biz onu başqasından istəsək, onun hakimliyinə və sərhəddinə daxil olmuşuq. .Allahın işlərindən olan şəfaəti, Allahdan qeyrisindən istəmək şirkdir

Bu açıqlamaya əsasən qarşıya sual çıxır ki, şəfaət Allahın haqqıdırsa, niyə Allahın haqqı olan şeyi, Allahdan qeyrisindən istəmək şirk olur? Şirk hansı şeydədir? Şirk feldədir, yoxsa ibadətdə? İstəmək ibadət deyil. Ən uzağı bunu deyə bilərik ki, bihudə bir işdir. Məsələn, Zeydə aid bir işi, Əmrdən istəmək, ən uzağı bihudə və mənasız işdir. Amma şirk deyil. Şəfaət istəməyin hətta bihudə olmadığını da deyə bilərik. Çünki qabaqcadan dediyimiz kimi, heç bir müsəlman Peyğəmbər (s) və övliyadan şəfaət istəyəndə, .Peyğəmbər (s)-in Allahın izni olmadan ona şəfaət etməsinə etiqadlı deyil

Bundan əlavə, şəfaət haqqı Peyğəmbər (s)-ə, Allah vəlisinə, salehlərdən və mələklərdən birinə veriləndən sonra, əgər biz desək, indiki Allah bu haqqı sənə verib, bizi də bu haqdan faydalandır. Bunun nə iradı var? Bu sözün harası şirkdir. Biz ,Peyğəmbər (s)-dən istəyirik

günahkarları şəfaət etmək üçün Allahın ona bağışladığı haqqın vasitəsilə, bizə də“ şəfaət etsin”. Şəfaət etməyin ixtiyar və icazəsi Peyğəmbər (s)-ə aiddir və hamını şəfaət etməyə məcbur deyil. Əlbəttə onun şəfaəti müəyyənləşmişdir. Yəni xüsusi şərtləri olan şəxslərə şəfaət olunacaq. Allahın izni də şəfaət üçün bu kəslər barəsində verilmişdir. İndi əgər biz desək: “Ey Allah Rəsulu! Bizi də onlardan qərar ver” bu niyə ?şirkdir

Kəşful-irtiyabda və onların digər sözlərində də gözə çarpan başqa bir ibarə vardır ki, onu da araşdırmalıyıq. Əvvəlcə öz ardıcıllarına belə bəhs etməyi öyrədir ki, əgər bir kəs sizə desə: Allah Rəsulu (s)-in şəfaətini inkar edirsənmi? Ona de: xeyr, inkar etmirəm, əksinə onu şəfaət edənlərin şəfaətçisi bilirəm və onun şəfaətinə ümidim var. Bu :sözlərdən sonra deyir

Şəfaət ümumiyyətlə Allaha məxsusdur, Allahın buyurduğu kimi: “De, şəfaətin hamısı Allahındır”.(۱) Təkcə o icazə verəndən sonra şəfaət olacaaq. Necə ki, Quran buyurur: “Allahın izni olmadan, Onun yanında kim şəfaət edə bilər?”(۲) Peyğəmbər (s) də, Allahın iznindən sonra, hamı üçün şəfaət edəcək. Necə ki, Quranda buyurur: “Yalnız Allah bəyənən kəslər üçün şəfaət edərlər”.(۳) və Allah yalnız tövhidlə razılaşır, necə ki, buyurmuşdur: “Kim islamdan başqa bir din ardınca gedərsə, (belə bir din) heç vaxt (ondan qəbul olunmaz və o, axirətdə zərər çəkənlərdən olar”.(۴),(۵

səh:۲۹

---

.Zümər”, ۴۴“ . [۱] -۱

.Bəqərə”, ۲۵۵“ . [۲] -۲

.Ənbiya”, ۲۸“ . [۳] -۳

.Ali imran”, ۸۵“ . [۴] -۴

.Kəşfuş - şübəhat”, ۱۵“ . [۵] -۵

Bunların hamısı doğrudur və bu barədə ayələr çoxdur. Allahın, müşrikə şəfaət edilməsinə razı olmadığını qəbul edirik və özü Quranda buyurmuşdur: “Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə dilədiyi kimsə üçün bağışlar. Allaha şərik qoşan şəxs, şübhəsiz ki, (haqq yoldan) çox azmışdır”.(١)

O, yuxarıdakı sözlərinin davamında bu cür istinad edib, nəticə alır:

İndiki şəfaət tamamilə Allaha məxsusdur və yalnız onun iznindən sonra baş verir və“ Allah icazə verməyincə, nə Peyğəmbər (s) və nə qeyri peyğəmbər şəfaət etməzlər. Allah yalnız tövhid əhlinin şəfaəti üçün icazə verir. Deməli, şəfaətin ancaq Allaha məxsus olması, aydın oldu və şəfaəti ondan istəməliyik”. (٢)

Axırıncı aldığı nəticə, əvvəldə dediyi həmin müqəddimədir ki, şəfaət Allaha məxsusdur və s… . Axırda deyir: Deməli, şəfaətin Allaha məxsus olması aydın oldu. Nəticə müqəddimənin özüdür.

Bundan əlavə, biz Allahdan şəfaət istəməliyik nəticəsi, başqa müqəddiməllərlə uyğun deyil. Çünki özü deyir: Allah başqasına da şəfaət izni verir, indiki izin verir, ondan da şəfaət istəməyin nə eybi var? Beləliklə, “Allahdan qeyrisindən şəfaət istəmək olmaz” nəticəsi, o müqəddimələrdən isbat oluna bilməz.



---

١- [١]. “Nisa”, ١١۶.
٢- [٢]. “Kəşfuş - şübəhat”, ١۵.

### !Üçüncü yozum: Şəfaət istəmək, tövhidə ziddir

Burada da doğru yozum tapmağa və bu arqumenti ona əlavə etməyə çalışacağıq. Bəlkə onlar bu söz ilə: “Allah yalnız tövhidlə razılaşır” demək istəyirlər: Allah yalnız təkallahçıya şəfaət etməyə razıdır. Sən ki, şəfaət istədin, təkallahçı deyilsən. Yəni Allahdan qeyrisindən şəfaət istəməyinlə təkallahçılıqdan xaric oldun. Bu deyilənlərə :sübut. “Rəsailul-hədiyyətus- sünniyyə”dən birinci məqalənin ibarəsidir ki deyir

Hər bir müsəlmana vacib olan şey budur ki, iradəsini Allahına yönəldə, ona üz tuta,“ ona təvəkkül edə və onun bəndəlik haqqını sona yetirə. Belə bir şəxs əgər təkallahçı şəklində dünyadan gedərsə, Allah öz Peyğəmbəri (s)-ni onun üçün şəfaətçi qərar (verər. Nəinki bəndəçilik vəzifəsini tərk edib və onun əksinə yerinə yetirən şəxs ola.(١

:İbarənin davamında, “əksini yerinə yetirmək” çümləsini məna edir və deyir

Allahdan qeyrisinə üz tutmaq yerlərindən biri, Allahdan başqa heç kəsdən mümkün“ olmayan yerdə, Allahdan qeyrisinə təvəkkül edib, ümid etmək, həmçının Allahdan qeyrisinə pənah aparmaqdır. Bu iş müşriklərin əməli və onların etiqadıyla eynidir. (Dünyadakı bütün fitnələr, yalnız bu etiqada görə yarandı,”.(٢

Gördüyünüz kimi, şəfaət istəməyi tövhidə zidd və şirklə bərabər bilmişdir. Bu bəyanla ki, şəfaət Allahın əlindədir və Allah da yalnız təkallahçıya şəfaət edər. Allahdan qeyrisindən şəfaət istəyən şəxs, təkallahçı deyil və müşrikdir. Deməli, şəfaət onun .halına şamil olmaz



---

.Kəşful – irtiyabdan nəql ilə”, ٢٠٨“ . [١] -١

.Həmin . [٢] -٢

## Dəlil müddəanın özüdür

Burada da dəlili müddəanın özü qərar tutması, açıq- aydındır. Sual budur ki, belə bir şəxs niyə müşrikdir? Əsasən bizim bəhsimiz budur ki, əgər bir kəs şəfaət istəsə, müşrikdir ya yox? Bu zaman mövzunu qəti tutub və dəlil kimi ortaya qoyur. Bundan .əlavə, bu ibarələrdə, bir az da şüar kimi qarşılaşmışdır

Əziz Peyğəmbər (s)-ə xitab edib deyən kəs: Ey Allahın Rəsulu (s)! Mənə şəfaət et. Bu istəmək budur ki, “Ya Rəsuləllah ud`u li” ya: “İstəğfir li” Ey peyğəmbər, mənim üçün ?dua et, ya bağışlanmaq istə” bunun nə eybi var

Peyğəmbər (s)-in zamanında da, camaat Peyğəmbər (s)-ın xidmətinə gəlir və istiğfar :diləyirdilər. Bu məsələ Qurani - Kərimdə açıqca zikr olunmuşdur

{وَلَوْ أَنَّهُمْ إِذ ظَّلَمُواْ أَنفُسَهُمْ جَآؤُوكَ فَاسْتَغْفَرُواْ اللّهَ وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُواْ اللّهَ تَوَّابًا رَّحِيمًا}

Onlar (münafiqlər) özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib, Allahdan“ bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın (tövbələri qəbul edən, mərhəmətli olduğunu bilərdilər”.(۱)

Bu ayə, Allah rəsulu (s)-dan bağışlanmaq istəməyi pisləmir, əksinə həvəsləndirir. :Yəqubun övladları da ona dedilər

{يَا أَبَانَا اسْتَغْفِرْ لَنَا ذُنُوبَنَا}

(Oğlanları ona:) Ata! Bizim üçün günahlarımızın bağışlanmasını dilə”.(۲)“

:O da dedi

səh:۳۲

---

.Nisa”, ۶۴“ . [۱] -۱

.Yusif”, ۹۷“ . [۲] -۲

{سَوْفَ أَسْتَغْفِرُ لَكُمْ}

(Tezliklə sizin üçün istiğfar edərəm".(۱"

Şəfaətin mənası yalnız budur ki, Peyğəmbər (s), imamlar (ə), övliya və salehlərdən, qiyamət günü bizim üçün dua və istiğfar etmələrini istəyirik. Həmçinin mələklərdən bizim üçün bağışlanmaq istəmələrini istəyirik. Çünki mələklər möminlər üçün istiğfar edirlər. Bu Allahdan qeyrisinə üz tutub və Allahdan qeyrisinə təvəkkül etməkdirmi? Kim peyğəmbər(s)-ə Allahdan ayrı şəkildə təvəkkül etmişdir? Şəfaət istəmək, Peyğəmbər ?(s)- ə təvəkkül edib, Allahdan üz döndərmək sayılırmı

Əlbəttə, bütpərəstlər belə idilər, Allahla işləri yox idi, yalnız bütü görürdülər və deyirdilər: Biz Allaha ibadət edib və ona yaxınlaşa bilmirik. Ona görə də diqqətləri .yalnız bütə idi

Peyğəmbərdən, ya Allah övliyalarından hacət və şəfaət istəyən şəxs, Allahdan üz çevirib, Allahdan qeyrisinə üz tutmamışdır. Peyğəmbər (s) - dən istəyir ki, mənim üçün dua et. Bu şəxs Allaha üz tutmuşdur. Lakin deyir: "Ey peyğəmbər (s)! Mənim üçün dua ."et

Bunların özləri deyirlər: Peyğəmbər (s) və mömin diri olarkən, dua istəməyin iradı yoxdur. Şəfaət istəməyin də dua istəmək kimi olduğunu deyirik. Lakin o Həzrətin ölüm ?zamanındadır. Peyğəmbər (s) – in ölümü, şəfaət istəməyin şirk olmasına səbəbdirmi

.Bu "Allahdan qeyrisinə üz tutmaq" deyil və tövhidlə ziddiyyəti yoxdur



---

.Yusif", ۹۸" . [۱] -۱

### Dördüncü yozum: Şəfaət istəməyin bihudə olması

Dördüncü yozum budur ki, deyilə bilər: Əgər İlahi şəfaət haqq, Allaha məxsus və təkcə onun izni ilə Allahın razı olduğu şəxslərə aiddirsə, onu Allahdan qeyrisindən istəmək bihudə və əbəsdir. Elə bil ki, sizin bir vəzifəniz var və bir iş sizə aiddir. Bir nəfər sizdən başqasından bu işi görməyi istəsə, bu bihudədir. Çünki sizin işinizi başqasından .istəmişdir

Bu izaha də cavab veririk ki, əvvəla: fərz edək, bihudədir, şirk ki, deyil. Bihudəlik və şirk arasında çoxlu fərq var. İkinci: bihudə də deyil. Çünki biz şəfaəti yaddan istəməmişik, əksinə o şəxsdən istəmişik ki, şəfaət onun əli ilə yerinə yetirilir. Misal olaraq, biz öz işimizi yerinə yetirməyi, həm idarənin rəisindən istəyə bilərik və həm onun .müavinindən. Çünki rəis tərəfindən ona, işi görmək məsuliyyəti və ixtiyarı verilmişdir

Onların sözlərində dörd yozum və təfsir vardır. Bu yozumların bəzisi, açıq deyil və .başqa ibarələrlə bəyan olmuşdur

### Beşinci yozum: Şəfaət istəmək şəfaət edənin müstəqilliyinə etiqad bəsləməkdir

Onların əsərlərindən istifadə olunan, bu sözlərin hamsının mənşəyi olma ehtimalı verilən başqa bir izah və yozum budur ki, Peyğəmbər (s)-dən, ya Allah övliyalarından şəfaət istəməyin mənasını, Allahın izni olmadan şəfaət etmələri bilmişlər. İndi bu məsələ, ya onların təsəvvürüdür və ya bilərəkdən belə bir şeyi bizə nisbət vermək .istəmişlər

Burada yada salınmalı heç də pis olmayan məsələ budur ki, şəfaət istəmək şiəyə məxsus deyil. İslamın bütün

firqələrində olmuşdur. Tarixi dəlillər və rəvayətlər də bu məsələni təsdiqləyir. Bizim dövrümüzdə, mənfi təbliğat nəticəsində şəfaət istəmək məsələsi bir az məhdudlaşmışdır, bununla belə, hal - hazırda müsəlmanların çoxu əziz Peyğəmbər (s) .- dən şəfaət istəyirlər və bu məsələ şiəyə məxsus deyil

Onlar elə bilirlər ki, şəfaət istəmək bu mənadadır ki, Peyğəmbər(s), ya Allah övliyaları Allahın izni olmadan şəfaət etsinlər. Əgər belə bir nisbət doğru olsaydı, onların sözü də .düz olardı

Biz peyğəmbər (s)-dən, Allahın izni olmadan bizə şəfaət etməsini istəsək, Peyğəmbər (s) üçün mümkün olmayan bir işi istəmişik. Çünki Peyğəmbər Allaın izni olmadan şəfaət .edə bilməz. Bu iş həm qeyri mümkündür və həm də Allahın haqqına qarışmaqdır

İndi Məhəmməd bin Əbdül Vəhhabın sözlərində işlənən və “Ərbəul - qəvaid” risaləsində gələn, onların bizim barəmizdə bu cür təsəvvür etmələrini göstərən ibarəni araşdırırıq. Əlbəttə, bu ibarəni qabaqcadan oxumuşduq, lakin daha çox diqqət üçün, .təzədən oxuyuruq

:Burada şəfaəti iki qisim edir və deyir

Şəfaət iki qisimdir: Mənfi (qadağan olunmuş) şəfaət və Müsbət (doğru) şəfaət. Mənfi“ şəfaət odur ki, Allahdan başqa heç kəsin qadir olmadığı şeyi, Allahdan qeyrisindən istəmək. Onun dəlili mübarək ayədir ki, buyurur: “Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün (qiyamət günü) gəlməmişdən əvvəl, sizə verdiyimiz ruzidən paylayın! Kafirlər (bunu inkar edənlər) isə (özlərinə) zülm (edənlərdir!”.(١)



---

.Kəşful – irtiyabdan nəql ilə”, ٢٠٨“ . [١] -١

:CAVAB

Bu ayə buyurur: Qiyamət günündə şəfaət yoxdur. Amma görəsən şəfaət qapısı ümumiyyətlə bağlı olub, heç bir şəfaət yoxdurmu? Qətiyyən məqsəd bu deyil. Çünki bu :ayədən sonra, “ayətul kursi” dir ki, buyurur

{مَن ذَا الَّذِی یَشْفَعُ عِنْدَهُ إِلاَّ بِإِذْنِهِ}

(Allahın izni olmadan, Onun yanında kim şəfaət edə bilər?_”(١)_“

Şəfaətin Allahın iznilə olması məsələsini, Qurani-Kərim də onun mümkünlüyünü və baş .verməsini təsdiqləmişdir

Başqa ayələr də var ki, şəfaətin ümumiyyətlə qadağan olmamasına dəlalət edir, o :cümlədən bu ayə

{لَا یَشْفَعُونَ إِلَّا لِمَنِ ارْتَضَی}

Onlar yalnız (Allahın)__ __razı olduğu (izin verdiyi)__ __kəslərdən ötrü şəfaət edə_“ (bilər_”.(٢)

:Onların özləri də, Allahın izni ilə olan şəfaəti qəbul edirlər. Hər vaxt ayə buyursa

Heç bir şəfaət yoxdur”, bu ümumidir. Çünki “la nəfy” işlənib və nəkrə nəfylə, «ولا شناعةً» ümumiyyəti çatdırır. Zahirdə şəfaət ümumiyyətlə inkar olmuşdur. Amma sonrakı :ayədə buyurur

{الا باذنه}

yalnız onun iznilə”, mənfi şəfaətin, icazəsiz şəfaət olması məlum olur. İndi ki, mənfi“ şəfaət icazəsiz şəfaət oldu, şəfaət iki qisim olur: İcazəli şəfaət və icazəsiz şəfaət. Mənfi şəfaət icazəsiz, müsbət şəfaət isə icazəli şəfaətdir. Sonra Məhəmməd bin :Əbdül-vəhhab, yuxarıdakı ibarənin ardınca, şəfaətin ikinci qismi barəsində deyir

Müsbət şəfaət, Allahdan istənilən şəfaətdir. Şəfaət edən o şəxsdir ki, şəfaət haqqı“ ”.olduğuna görə əziz tutulub. Şəfaət olunan da o kəsdir ki, onun sözü və işi bəyənilsin

Bu sözün mənası budur ki, Allahdan qeyrisindən istənilən şəfaətlərin hamısı, Quranda inkar olunmuşdur və belə bir şəfaət, Allahın izni olmadandır. Bu sözlər təqribən bunu çatdırır ki, təsəvvür edirlər, şəfaətçilərdən istənilən şəfaət, icazəsiz şəfaət və şəfaət .edənin müstəqilliyinə etiqad ilədir

Digər məsələ, “əl-Hədiyyətus-sunniyyə” məqaləsinin əvvəlində gələn məsələdir ki, qabaqlar onu gətirmişdik. “Bu Allahdan qeyrisinə üz tutub və təvəkkul etməkdir, hansı :ki, müşriklərin iş və etiqadları ilə eynidir və s...”. deyəndən sonra yazır

Bu dünyada Allahdan qeyrisindən şəfaət istəmək, şəfaətin Allahın izni və Onun razı olduğu şəxslə rabitənin olmasına etiqad və gumanla birgədir. Bir halda ki, Allah buyurur: “Sizin Ondan başqa heç bir haminiz və şəfaət (əzabı dəf) edəniniz yoxdur”.(١) ((٢

Bu cümlə bunu çatdırır ki, hər kəs Allahdan qeyrisindən şəfaət istəsə, etiqadı budur ki, şəfaətin nə Allahın iznilə rabitəsi var və nə də şəfaət olunan şəxsdən Allahın razı .olmasına bağlıdır

Aydındır ki, şəfaətin iki şərti var: Biri Allahın izni və o birisi şəfaət olunan şəxsin qabiliyyəti. Bu dünyada Allahdan qeyrisindən şəfaət istəmək, bizim həm Allahın razılığını şərt bilməməyimizi və həm də şəfaət olunandan razılığın olmamasını lazım ,tutur. Bir halda ki



---

.Səcdə ”,۴“ .[١]-١

.Kəşful-irtiyab ”,٣٠٧“ .[٢]-٢

:Allah buyurur

{مَا لَكُم مِّن دُونِهِ مِن وَلِيٍّ وَلَا شَفِيعٍ}

(Sizin Ondan başqa heç bir haminiz və şəfaət (əzabı dəf) edəniniz yoxdur”.(١)“

Şəfaət istəmək barəsində onların belə təsəvvür və nəticə almalarına bizim üçüncü .sübutumuz olan digər bir ibarə, Sənanidən nəql olunan məsələdir

:O deyir

Hər kəsin diri, ya ölü barəsində belə bir fikri olsa ki, o insanı Allaha yaxınlaşdırır,“ həmçinin dünya ehtiyaclarından biri barəsində, ondan şəfaət istəməklə, Allah yanında şəfaət edir və onun ehtiyacını yerinə yetirir, Allaha şərik qərar vermişdir. Necə ki, müşriklər bütlər barəsində belə düşünürdülər. Ona görə də malları halal və qanlarını (tökmək mübah oldu”.(٢

Əgər onların nəzəri budursa, deməliyik ki, heç bir şəxs Peyğəmbər (s), ya İlahi övliyalardan, heç bir şərt, əhd və Allahın izni olmadan, təkcə şəfaət istəməklə onun .üçün şəfaət edərlər əqidəsilə, şəfaət istəmir

Əslində “Ey Allahın Rəsulu (s) bizə şəfaət et!”, “Allahın vəlisi bizə şəfaət et!” mənası bu deyil ki, sənin Allah qarşısında müstəqil aparatın var və özün Allahın izin və icazəsi olmadan şəfaət et, ya bizim günahlarımızı bağışla. Əgər bir kəsin belə əqidəsi olsa, biz ?də deyirik şirkdir. Amma hansı müsəlman və təkallahçının belə bir batil əqidəsi var

İkinci dəlil: Müşriklərin şirki, şəfaət istədiklərinə



---

.Səcdə”, ۴“ . [١] -١

.Kəşful-irtiyab,٢٠٨ . [٢] -٢

**İkinci dəlil: Müşriklərin şirki, şəfaət istədiklərinə görədir**

Onlar deyirlər: İslamın əvvəlində Peyğəmbər (s)-in müharibə etdiyi, öldürdüyü müşriklərin şirkinin nədə olduğunu bilməliyik. Müşriklərin, xaliqiyyətdə şirkləri vardımı? Bütpərəstlər bütlərin, rəbb, raziq və müdəbbir olmalarına inanırdılarmı? O kəslər ki, İsa (ə)-ı, əvya salehlərdən birini özlərinə rəbb seçmişdilər, həqiqətən onun rəbb olmasına və xaliq olmasına inanırdılarmı? Sonra deyirlər: Bu suala Quran cavab :vermişdir

{وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ لَيَقُولُنَّ اللَّهُ}

Ya Rəsulum!) Həqiqətən, əgər sən (müşriklərdən): “Göyləri və yeri kim yaratmışdır?” )“ (-deyə soruşsan, onlar mütləq: “Allah!” -deyə cavab verəcəklər”.(۱)

Deməli, onların şirki, rübubiyyətdə, xaliqiyyətdə, raziqiyyətdə, tədbirdə və s.... olmayıb, əksinə bunda idiki deyirdilər: Biz bütləri vasitə və şəfaətçi qərar veririk və büt bizim şəfaət edənimizdir. Ona görə Peyğəmbər (s) müşrikləri nəcis bilib, onlarla müharibə .etdi, mal və canlarını halal etdi

İstinad etdikləri dəlilin davamında deyirlər: “Büt mənim şəfaətçimdir deyən şəxslə, Həzrət İsa, ya Peyğəmbər (s), ya övliyalardan biri mənə şəfaətçidir deyən şəxs arasında, nə fərq var? Hər ikisi eynidir və birinci müşrik olduğuna görə ikinci də müşrik (sayılır”.(۲)

:Məhəmməd bin Əbdül-Vəhhabın sözü belədir

Allah düşmənlərinin bəzi sözləri vardır ki, onunla camaatı haqq yoldan saxlayırlar. O“ :cümlədən deyirlər



---

.Loğman”, ۲۵“ . [۱] -۱

.Bu məsələlərin təfsilatı, kəşfuş – şübəhatda, ۶ – cı səhifədən sonra gəlmişdir . [۲] -۲

Biz Allaha müşrik deyilik, əksinə şəhadət veririk ki, şəriksiz və vahid Allahdan başqa heç kəs yaratmır, ruzi vermir, zərər və xeyir yetirmir. Hətta Həzrət Məhəmməd (s)-in də öz xeyir və zərəri əlində deyil, o ki qala Əbdülqadir(۱) ya başqalarına. Lakin mən günahkaram, salehlərin isə Allah yanında məqam və dəyəri olduğuna görə, Allahdan (onların vasitəsi ilə hacət istəyirəm".(۲

Əslində belədir, onun diliylə Allah düşmənləri və bizim dilimizlə, Allah dostları bunu deyirlər ki, ruzi verən, yaradan, diriləndən və öldürən Allahdır. Peyğəmbər (s) – də özü üçün xeyir, zərər, ölüm və həyata, həşr və nəşrə sahib deyil, o ki qala qeyri peyğəmbərə. O, bu sözlərdən sonra, öz ardıcıllarına öyrədir ki, əgər belə bir şey :desələr, onlarla bəhs et və de

Peyğəmbər (s) - in müharibə etdiyi kəslər də bu sözü dəyişdirdilər və onların məqsədi" də Allah yanında məqam, dəyər və şəfaət idi. Nümunə olaraq, onun üçün Quran (ayələrini oxu və izah ver".(۳

Onun məqsədi bütpərəstlər barəsində olan ayələrdir. O cümlədən, aşağıdakı ayələr ki, .bu bəhsdə çox istifadə olunur

{وَالَّذِينَ اتَّخَذُوا مِن دُونِهِ أَوْلِيَاءَ مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَى}

Allahı qoyub (bütləri) özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha" yaxınlaşdırmaq üçün ibadət



---

Onun məqsədi Əbdül qadir Gilani, Qadiriyyə firqəsinin banisidir. ۵۶۱ h, q vəfat . [۱] -۱ etmiş və Bağdadda dəfn olunmuşdur. Sünnilərdən bəzisi onun ziyarətinə gedirlər. Bu .cümlədən, onun tərəf müqabillərinin təkcə şiələr olmadığı məlum olur

.Kəşfuş – şübəhat", ۱۲" . [۲] -۲

.Həmin, ۱۲ . [۳] -۳

(edirik!" (deyirlər)".(١)

{وَيَعْبُدُونَ مِن دُونِ اللّهِ مَا لاَ يَضُرُّهُمْ وَلاَ يَنفَعُهُمْ وَيَقُولُونَ هَؤُلاء شُفَعَاؤُنَا}

Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir" (və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər".(٢)

:Məhəmməd bin Əbdül-Vəhhab ardında deyir

Əgər desə ki bu ayələr bütpərəstlər barəsində nazil olub, salehlər isə büt deyildir, ona" qabaqlar dediyimizlə cavab ver. Çünki əgər təsdiq etsə ki, kafirlər də, rübubiyyətin Allaha məxsus olduğuna şəhadət verirdilər, onların başqalarına üz tutmaqlarından .məqsədləri, şəfaətdir

Kafirlərin işi ilə öz işi arasında fərq qoymaq istəsə, ona de: Kafirlərdən bəzisi bütləri çağırırdılar və bəziləri də övliyalardan istəyirdilər ki, Allah onlar barəsində buyurmuşdur: "Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır".(٣) Həmçinin Məryəm oğlu İsanı və anasını çağırırlar, bir haldaki Allah buyurur: "Məryəm oğlu Məsih ancaq bir (peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib getmişdir".(۴),(۵)

:Bu məsələni və bir neçə ayə zikr edəndən sonra, deyir

Ona de: Bütlərə üz gətirən şəxsi Allahın kafir bildiyini, salehləri qəsd edən şəxsi də" kafir saydığını və Peyğəmbər (s) –in də onlarla müharibə etdiyini bilirsənmi? Əgər desə: Kafirlər bütlərin və salehlərin



---

١- [١] . "Zümər", ٣.

٢- [٢] . "Yunus", ١٨.

٣- [٣] . "İsra", ۵٧.

۴- [۴] . "Maidə", ٧۵.

۵- [۵] . "Kəşfuş – şübəhat", ١٣.

özündən istəyirdilər, mən isə şəhadət verirəm ki, təkcə Allah fayda verən, zərər yetirən və müdəbbirdir. Mən Allahdan qeyrisindən istəmirəm və dünya işlərini salehlərin ixtiyarında bilmirəm. Lakin mən onları qəsd edirəm və Allahdan onların şəfaətinə ümidim var. Ona cavab ver ki, bu kafirlərin dediyilə eynidir (deyirdilər: bütlər heç nə edə bilmirlər, biz Allahdan istəyirik və bunları vasitə və şəfaətçi qərar veririk), :bu vaxt Allahın sözünü onun üçün oxu ki, buyurdu, kafirlər deyirdilər

Biz bütlərə yalnız bizi Allaha yaxın etdiklərinə görə pərəstiş edirik".(١) Ya deyirdilər:" ("Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir".(٢) , (٣

Bu iki ayəyə istinad etməklə, mərhum Əmin nəql edir ki, bunlar Şeyx Məğribiyə bir :məktubda yazdılar

Hər kəs özü və Allah arasında vasitələr qərar verib, onlardan şəfaət istəsə, onları" (pərəstiş etdiyini və müşrik olduğunu xəbər ver".(۴

İstifadə etdikləri arqumentin xülasəsi budur ki, Quran iki ayədə, müşriklərin və büt- :pərəstlərin şirkini bu cür bəyan etmişdir ki, onlar deyirdilər

{هَؤُلاء شُفَعَاؤُنَا}

(Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!".(۵"

{مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَى}

(Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!".(۶"



---

.Zümər", ٣" . [١]-١

.Yunus", ١٨" . [٢]-٢

.Kəşfuş – şübəhat", ١٣" . [٣]-٣

.Kəşful – Irtiyab", ٢٠٧" . [۴]-۴

.Yunus", ١٨" . [۵]-۵

.Zümər", ٣" . [۶]-۶

Bu işi siz də görürsünüz. Onların şirki bunda idi. Peyğəmbər (s) də buna görə onlarla vuruşdu. Çünki onlar başqa bir şeyə görə müşrik olmadılar. Sizin işiniz də peyğəmbərləri, övliyaları və salehləri vasitə qərar vermək olduğuna görə, onların işi .kimidir, siz də müşriksiz

**Birinci cavab: Müşriklərin şirki, bütlərə ibadət etdiklərinə görədir**

:Bu dəlilə bir neçə cavab veririk

Birinci cavab: Onların şirki, "bunlar bizim şəfaətçilərimizdir" dediklərinə görə deyildi, əksinə onların şirki bütlərə pərəstiş etmələrində idi. Öz istidlallarında istifadə etdikləri iki ayə də, açıqca bu məsələyə dəlalət edir. Çünki birinci ayədə, müşriklərin dilindən :buyurur

."Biz onları yalnız bizi Allaha yaxın etdiklərinə görə ibadət edirik"

Onlar bütlərə ibadət və pərəstiş edir, bütlər üçün səcdə edirdilər. Hər tayfanın xüsusi bir ibadəti var idi, hətta xüsusi namaz qılır və bütlər üçün qurbanlıq kəsirdilər. Qurbanlıq kəsmək, özü ibadət sayıla bilər. Biz də, hacda Həzrət İbrahim (ə) - ın .zamanından qalan sünnəyə əsasən, minada qurbanlıq kəsirik

Onlar bütlərin qarşısında, təvazö, xuşu, zəlillik və nalə çəkib ağlayırdılar. Həmçinin heyvan kəsən vaxt bütlərin adını deyirdilər. Müsəlmanlar arasında da sünnə və vacibdir ki, heyvan kəsən vaxt, Allahın adını çəkib və bismillah desinlər. Yəhudilərdə də bu sünnə olub ki, Allahın adını (hansı sözlə ki, deyirdilər) desinlər. Quran da bu :məsələyə işarə edir və buyurur

{وَلاَ تَأْكُلُواْ مِمَّا لَمْ يُذْكَرِ اسْمُ اللّهِ عَلَيْهِ}

(Üstündə Allahın adı çəkilməmiş heyvanların ətindən yeməyin”.(1)“

Bütpərəstlər, heyvan kəsən vaxt, Allahdan qeyrisinin adını, Lat və Üzza, ya başqa bütlərin adını çəkirdilər və sonra kəsirdilər. Onların şirki bunda idi ki, Allahpərəst və təkallahçı insanın Allah qarşısında ibadət və pərəstiş kimi yerinə yetirdiyi şeyi, başqa cür formada bütlər üçün yerinə yetirirdilər. Onların şirki şəfaətə inandıqlarına aid .olmamışdır

İkinci ayədə də iki məsələ qeyd olmuşdur: Biri “Və yəbudunə min dunillah”. O biri. “Və yəqulunə haulai şufəauna”. Bu iki məsələ “vav atifə” vasitəsilə ki, fərqə dəlalət edir, bir – birindən ayrılmışdır. Deməli, ayə müşriklərin şirkinin bütləri şəfaətçi bilmələrinə görə olduğuna dəlalət etmir. Hər iki ayədə, əvvəlcə Allahdan qeyrisinin pərəstişi deyilir və pislənilir, sonra müşriklərin sözləri nəql olur ki, deyirdilər: “Biz bunları şəfaətçi və Allaha yaxınlaşma vəsiləsi qərar veririk”. Aydındır ki, şirkə səbəb olan birinci hissədir. Müşriklərin ibadətdə şirkləri olduğunu demək lazımdır. Vəhhabilərin özü də müşriklərin .əməlini, ibadətdə şirk bilirlər

Əgər ibadət arada olmasa, insan şəfaətçini pərəstiş etməsə və şəfaətçinin (Allahla əlaqəsini nəzərdə tutmadan) xeyir və zərər yetirmədiyinə, əksinə öz xeyir və zərərinin də öz əlində olmadığına, lakin eyni halda kamil varlıq və Allah dərgahına yaxın olan uca bir insan olduğuna, məsələn mürsəl peyğəmbər olmasına etiqadlı olsa, bu şirk olmayacaq. Müşriklərin əməli ilə heç bir rabitəsi olmayıb



---

.Ən`am”, ۱۲۱“ .[۱]-۱

.və onların işi ilə müqayisə ediləsi deyil. Çünki onlar şəfaətçini Allah bilirdilər

Bəzən bir şəxs bütə səcdə edir və deyir: bu mənim Allahımdır, ya mübarək ayəyə :əsasən

(Vəlləzinət-təxəzu min dunihi əvliya"(١)"

Onu öz ağası qərar verir, ona ibadət edir, onun üçün qurbanlıq kəsir. Qurban kəsən vaxt onun adını çəkir, onun üçün namaz qılır və hac edir. Bütün işləri onun üçün yerinə yetirir və deyir: Mənim şəfaətçim bu bütdür. Bu şəxs yüz faiz müşrikdir və ibadətdə şirki vardır. Bunu peyğəmbəri insan və Allah məxluqlarından biri bilən və yalnız, Allah ona şəfaət izni verdiyinə görə, ondan mənə şəfaət etməsini istəyirəm, deyən şəxslə ?müqayisə edin. Bunlar bərabərdirlərmi

Vəhhabilər (onlardan nəql olunanlara əsasən) hər vaxt bütpərəst və müşriklərin növlərini (ibadətdə şirk bəhsində) açıqlamaq istəyəndə, heç vaxt şəfaəti bəhs etməyiblər. Bunun özü buna dəlildir ki, onların özü də, şirki təbii formada açıqlayanda, .müşriklərin şirkini, şəfaət istəməkdən başqa yerlərdə bilirlər

Bu yerlərdən biri, İmamul-Bəkrinin, əl-Hədiyyətus - sunniyyənin üçüncü məqaləsində nəql olunan bir ibarədir. Qurani - Kərimin bəzi ayələrində, müşriklərin etiqadlarından danışanda, onlarda Allahtanıma fitrətini sabit bilir və buyurur: Onlar işlərin müdəbbirini, malik və xaliqini Allah bilirdilər. Bu ayələrdən biri Yunus surəsindəndir ki, :İmam Bəkri onun ardınca bir neçə məsələyə işarə edir



---

.Zümər ",٣" .[١]-١

:Mübarək ayə budur

{قُلْ مَن يَرْزُقُكُم مِّنَ السَّمَاء وَالأَرْضِ أَمَّن يَمْلِكُ السَّمْعَ والأَبْصَارَ وَمَن يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ وَيُخْرِجُ الْمَيَّتَ مِنَ الْحَيِّ وَمَن يُدَبِّرُ الأَمْرَ فَسَيَقُولُونَ اللّهُ فَقُلْ أَفَلاَ تَتَّقُونَ}

Ya Rəsulum!) De: “Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib (“ olan (onları yaradan) kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan (sahmana salan) kimdir? Onlar: “Allahdır!” –deyəcəklər. De: “Bəs onda Allahdan (qorxmursunuz?”(١)

Əgər desən: Müşriklərin Allahın xaliqliyi, işlərin tədbiri və malikliyinə və s... etiqadları“ ?olduqları vaxt, bəs necə olur ki, yenə də bütlərə ibadət edirdilər

Cavab veririk ki, Onların etiqad və təsəvvürləri bu idi ki, bütlərin ibadəti Allahın ibadətidir və onlar bütlərin ibadəti vasitəsilə, Allaha yaxınlaşırlar. Bu barədə hər bir firqənin özünə məxsus etiqad və yolu var idi. Onların bir dəstəsi deyirdilər: Bizim Allahı vasitəsiz ibadət etmək üçün ləyaqət və səlahiyyətimiz yoxdur. Çünki Allahın əzəməti çox böyükdür, ona görə də biz bütləri ibadət edirik ki, bizi Allaha yaxınlaşdırsınlar. Başqa dəştə deyirdi: Mələklərin Allah yanında məqam və üstünlükləri var. Biz mələklər formasında heykəllər düzəldirik ki, bizi Allaha yaxın etsinlər. Başqa bir dəstə də deyirdi: Biz bütləri özümüzə qiblə qərar veririk, necə ki, Kəbə Allahın ibadəti üçün qiblə qərar verilmişdir. Başqa bir dəstə də inanırdı, hər bir mələyin yanında şeytan qərar verilib ki, Allahın əmrinə əməl edir. Bütün ibadət haqqını yerinə yetirən və lazımınca ona ibadət edən şəxsin ehtiyaclarını şeytan yerinə yetirir. Əgər belə etməsə, şeytan Allahın əmri ilə onu çətinliyə və



---

.Yunus”, ۳۱“ .[۱]-۱

(müsibətə düçar edir”.(١)

Görürsüz ki, İmam Bəkrinin dediyinin hamısı, bütlərin ibadəti barəsindədir, yəni Müşriklərin sözləri yalnız bu deyildi ki, büt bizim şəfaətçimizdir, əksinə onlar bütə ibadət edirdilər və şirkləri də bütün ibadətinə aid idi. Yalnız Allaha pərəstiş etsəydilər və təkcə bütün onlara şəfaət etməsinə inansaydılar, müşrik olmazdılar. Əlbəttə, bu etiqad da səhv və bihudədir. Çünki bütün şəfaət etmək qüdrəti yoxudur və şəfaətə .izinli də deyil. Hər halda, əgər bütün ibadətilə yanaşı olmasa, şirkə səbəb olmaz

İndiki zamanda da, bütpərəstlərin bütə ibadəti üçün xüsusi adət və ənənələri vardır. Ən azı ibadəti budur ki, xüsusi bir formada bütün qarşısında dayanırlar və işarə ilə, .bütün qarşısında təzim kimi xüsusi hərəkətlər yerinə yetirirlər

Hindistanda bu səhnəyə çox rast gəlinir ki, bütxanaya getmək üçün vaxtı olmayan şəxs, hoteldən çıxarkən, orada qoyulan bütün qarşısında dayanır, dodaq altında bəzi şeyləri zümzümə edir, xüsusi hərəkətlər də yerinə yetirir. O həqiqətdə bütə ibadət edir .və sonra işinin dalınca gedir

**İkinci cavab: Müşriklərin rübubiyyətdə şirki var idi**

Elə bil vəhhabilər dəqiq bilirdilər ki, bütpərəstlərin şirki Allahın tədbiri və rübubiyyətində deyil, şirkləri yalnız ibadətdə olmuşdur. İbadətdə də yalnız o vaxt ki, :deyirdilər

{هَؤُلاء شُفَعَاؤُنَا}

bunlar bizim Allah yanında şəfaətçilərmizdir”, bütə“



---

.Kəşful – Irtiyab”, ۲۱۳ – ۲۱۴“ . [۱] -۱

ibadət edib, müşrik olurdular. Halbuki onlar ibadətdə müşrik idilər. Onların ibadətdə şirklərinin mənşəyi, rübubiyyətdə şirk idi, yəni dəlilsiz bütə pərəstiş etmirdilər, əksinə etiqadları bu idi ki, deyirdilər: Allah aləmi yaradıb və aləmin tədbirini mələklərə və .ruhlara tapşırmışdır

Əlbəttə əgər Allahın mələklər vasitəsilə işləri tədbir etməsinə inansaq, bu şirk deyil. :Quran da buyurur

{فَالْمُدَبِّرَاتِ أَمْرًا}

(And olsun işə əncam çəkənlərə”.(۱“

Mələklər və iş görən qüvvələr, Allahın əmri ilə, işlərin tədbirinə əmr olunmuşlar. Aləm əslində səbəb və nəticə aləmidir. Amma bütün bu səbəb və nəticələrə, Allahın nüfuzu və onun əmri altında əməl edirlər: Musəxxəratin biəmrih. Bu etiqad şirk olmayıb, eyni .tövhiddir

Müşriklər bizim etiqadın əksinə, inanırdılar ki, Allah bəşərin rizq və ruzisini bir ruha, ya bir mələyə, ya filan ulduza, məsələn şera ulduzuna tapşırdı. Evlənmə işinə əncam çəkməyi, yer, əkinçilik və bitki bitməsi işlərinə əncam çəkməyi başqa bir ruha, ya mələyə, dənizlərin işinə əncam çəkməyi digərinə tapşırdı. Xülasə budur ki: Dünya işlərinin, tədbir və rübubiyyətində müstəqil əncam çəkən və tədbirçilərə etiqadlı idilər. Qurani-Kərim də “ərbab” kəlməsi ilə bu məsələyə işarə edir: Ərbabun mutəfərriqun. .Rəbb, yəni tərbiyə və tədbir edən şəxs

Müşriklər, saysız rəbblərə inanırdılar və hər bir növ varlıq üçün, rəbb və tədbir edənə etiqadlı olub, deyirdilər: məsələn, insan növü üçün bir mələk rəbbdir. Hər bir şeyin bir növ rəbbi var, lakin biz o ruh, mələk, ya cini görmür və əlimiz ona yetişmir. Ona görə də ruh, mələk və cinlərin hər



---

.Naziat”, ۵“ . [۱]-۱

.biri üçün, bir surət düzəldir və heykəl ucaldırdılar ki, onun nişanəsi olsun

Əlbəttə, ağacın və daşın raziq olmadığını qəbul edirdilər, amma deyirdilər: Bu daşı onun üçün heykəl düzəltdiyimiz mələk, ya ruh, ruzi rəbbi və ruzi Allahıdır. Onun .heykəlini ibadət edirdilər, əslində o mələk, ya ruh ibadət olunurdu

Həzrət İsa (ə)-ı Allah bilənlər də, təkcə ondan şəfaət istəmirdilər, əksinə təslisə (üçlük əqidəsinə) inanc bağlamışdılar. Məsihi Allah və Allahı "üç ünsürdən təşkil" bilirdilər. Müşriklərdən bəzisi də deyirdi: Mələklər Allahın fərasətsiz qızları deyil, əksinə çox bacarıqlı və işgüzar qızlarıdır. Hansı ki, işləri tədbir edəndirlər, Allah işləri onların (öhdəsinə qoyub. Qurani-Kərim bu məsələyə işarə etmişdir.(١

.Nəticə: ١. Müşriklər bütlərə ibadət edir və ibadətdə şirkləri var idi

.İbadətdə şirkdən əlavə, rübubiyyət və tədbirdə də şirkləri var idi .٢

### Üçüncü cavab: Vəhhabilərin arqumentindəki yalnışın izahı

Bu dəlilə bizim üçüncü cavabımız, onların istinad etdikləri dəlillərində olan yanlış düşüncəyə iraddır. Onlar Peyğəmbər (s)-dən şəfaət istəməyin şirkə səbəb olmasını sübut etməyə çalışırlar. Bunu isbat etmək üçün, qeyd olunan iki ayəyə istinad ediblər.

Bu iki ayədə əsasən, şəfaət istəmək məsələsi bəhs olunmur. Birinci ayədə Müşriklər



---

.... Nəcm", ٢٧, "Nəhl", ۵٧, "Saffat", ١۴٩ və" . [١] -١

."deyirdilər: "Bütlərə yalnız bizi Allaha yaxın etdiklərinə görə pərəstiş edirik

Onların əqidəsinə görə bütlərə ibadət etməyin nəticəsi, Allaha yaxınlaşmaqdır. "Biz bütlərdən vasitə olmalarını və bizə şəfaət etmələrini istəyirik" məsələsi isə bu ayədə açıqlanmır. Hətta yaxınlaşmaq istəmək də ayədə yoxdur, əksinə nəticəsi yaxınlaşmaq olan ibadət açıqlanıb. Əgər yaxınlaşmaq istəmək də açıqlansaydı, yenə də bu, şəfaət istəməkdən başqadır, hansı ki, "günahı bağışlamaq və bağışlanmaq istəməkdən" .ibarətdir

:İkinci ayədə də buyurur

Bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"-" (deyirlər".(١

Bu ayədə də şəfaət istəməkdən danışılmır. Əgər bu iki ayədə şəfaət istəmək məsələsi ümumiyyətlə açıqlanmayıbsa, onda ayəyə necə istinad edib, demək olar ki, mübarək .ayə onların şirkini, bütlərdən şəfaət istəməklərində bilir

**Diqqətə layiq bir məsələ**

İndi biz, vəhhabilərin özündən sual edirik ki, siz Peyğəmbər (s) – in şəfaət etməsinə ?etiqadlı deyilsinizmi

Əlbəttə, cavab verəcəklər ki, bəli "Allah Rəsulu (s) şəfaəti qəbul olunan şəfaətçi"dir. Bu .haqq sözdür. Çünki Peyğəmbər (s), mələklər və Allah övliyaları şəfaət edərlər

Allah Rəsulu (s) şəfaəti qəbul olunan şəfaətçi"dir cümləsi ilə "Bunlar bizim" şəfaətçilərimizdir" cümləsi arasında fərq varmı? "Bütlər bizim şəfaətçilərimizdir" cümləsi onların şirkinə səbəb olur, "Peyğəmbər bizim



---

.Yunis", ١٨" .[١]-١

?şəfaətçimizdir” cümləsi isə, şirkə səbəb deyil

Bizim fikrimizcə, heç biri şirkə səbəb deyil. Ayədə (dediyimiz kimi) yalnız bütpərəstlərin dediyi söz, ”Bunlar bizim şəfaətçilərmizdir” açıqlanıb, Şəfaət istəmək məsələsi isə açıqlanmamışdır, o ki qala onların şirkinə səbəb ola. Əgər yalnız bu cümləni demək, şəfaət istəmək mənasında və şirkə səbəb olarsa, Peyğəmbər (s) barəsində o cümləni .demək də, həmin mənanı daşıyır və şirkə səbəb olacaq

**Səhv müqayisə**

Əgər indi bütün cavablara göz yumsaq, başqa bir məsələ ortaya çıxır ki, müsəlmanların Allah Rəsulu (s)-dan, ya övliyalardan şəfaət istəmələrini, bütdən şəfaət istəməklə (əgər bütpərəstlər şəfaət istəyirdilərsə) müqayisə etmək, yanlışdır. Bütpərəstlər bütləri heç bir qüdrətin təsiri altında görmədikləri üçün, Allahın onlara şəfaət izni verməsinə etiqadlı deyildilər. Halbuki biz, Peyğəmbər (s) və Allah övliyalarının Allahın iznilə şəfaət etmələrinə etiqadlıyıq. Ona görə də bunların ikisini bir .- birilə müqayisə etmək, məntiqi baxımdan düzgün sayılmaz

Deməli, Məhəmməd bin Əbdül-vəhhabın və digərlərinin sözlərində olan iradların hamısı, bütpərəstlərə şamil olur ki, özündən şəfaət qüdrəti olmayan və ona şəfaət izni verilməyən bir mövcuddan, nəyə görə şəfaət istəyirlər. Quran da açıqca xatırlayır ki, mövcudları öz şəfaətçiləri bilirlər. {لا يضرهم ولا ينفعهم}(Onlar “zərər və xeyir yetirməyən”(١) .Bu, heç vaxt müsəlmanların etiqadlı olduğu şəfaətlə müqayisə oluna bilməz



---

.Həmin , ١٨ . [١] -١

Biz deyirik: Peyğəmbər (s) -ın, mələklər və Allah övliyalarının (ə) Allah yanında üstünlük və məqamları vardır. Əgər Allah onlara şəfaət izni versə, biz onlardan Allah yanında bizə şəfaət etmələrini istəyirik. Bunların ikisi heç vaxt bir-birilə müqayisə olunan deyil .ki, o şirk olarsa, bu da şirk olsun

Quranın “izin” kəlməsinə çox təkid etməsinin hamısı müşrik və kafirləri nəzərə alaraq, onların qarşısındadır. Əks halda, heç bir müsəlman, nə Peyğəmbər (s) zamanında, nə sonrakı zamanlarda və nə də ümumiyyətlə heç dindar və Allahpərəst (əgər dini təhrif olmayıbsa) belə bir iddia etməyib və dilinə gətirməyib ki; “Bizim elə şəfaətçilərimiz var .”ki, Allahın izni olmadan bizə şəfaət edərlər

Kafirlərin əqidələri müsəlmanların əqidəsi ilə müqayisə oluna bilməz ki, deyirlər: Aləmin Allahı əgər peyğəmbərin duasını, bəndələrindən biri barəsində yerinə yetirmək, ehtiyacını yerinə yetirmək istəsə, onun ehtiyacını yerinə yetirər və ya onun günah və təqsirini bağışlayar. Bu bağışlamaq və qəbul da qəti və yüz faiz bir iş deyil, .Allah məsləhət bilərsə, qəbul edər

**Üçüncü dəlil: Allahdan qeyrisini çağırmaq qadağan olubdur**

Vəhhabilərin sözlərində olan, şəfaətə də məxsus olmayan, Peyğəmbər (s) və övliyadan hacət istəmək məsələsində də həmin dəlili açıqladıqları digər bir dəlil, şərif :ayəyə istinaddır ki, buyurur

«و ان المساجد لله فلا تدعوا مع الله احدا»

_Şübhəsiz ki, (bütün)__ __məscidlər Allaha məxsusdur. Allahdan_“

səh:۵۲

(başqa heç kəsə ibadət etməyin!_”(۱_

La təd-u” “dəvət” sözündən çağırmaq mənasındadır. Bu ayədə Allahdan qeyrisindən“ .hacət istəmək, çağırmaq və dua qadağan olmuşdur

Məhəmməd bin - Əbdül vəhhab deyir: “Allah düşmənləri ilə belə bəhs edin: Ona de, Allahın sənə ibadətdə ixlaslı olmağını vacib etməsinə və Allahın sənin boynunda bu haqqının olmasını təsdiq edirsənmi? Əgər desə: bəli etiraf edirəm. Ona de: Mənim üçün izah ver ki, sənə vacib olan şey nədir? İbadəti yalnız Allah üçün yerinə yetirmək (hansı ki, Allahın sənin boynunda olan haqqıdır) nə deməkdir? Bu formada ondan sual et, ona (görə ki Allahın düşmənləri, nə ibadəti tanıyırlar və nə də onun növlərini”.(۲

:Burada mərhum Əmin Kəşful-irtiyabda deyir

Bu cümlə, bütün müsəlmanlara və islam alimlərinə hörmətsizlikdir. Ona görəki iddia“ edir, bizim qarşı tərəfimiz, nə ibadəti tanıyır və nə də onun növlərini. Yalnız biz bilirik ki, ibadət hansıdır. Bu böyük bir hörmətsizlikdir, Çünki müsəlmanların hamısı vəhhabi deyildir. Vəhhabilər balaca bir firqədir. Onlar bu sözləri ilə, digər müsəlmanları Allah .”düşmənləri və ibadət məsələsində cahil sayırlar

:Məhəmməd bin Əbdül-Vəhhab ardınca deyir

İbadəti onun üçün belə açıqlayıb de: Allah Quranda buyurmuşdur: Allahınızı nalə və“ ağlamaq halında və gizlincə çağırın... .(۳) Bu sözü ona deyəndən sonra, soruş: Çağırmaq və dua etmək ibadətdir, ya yox? Naçar qalıb



---

.Cin”, ۱۸“ . [۱] -۱

.Kəşfuş - şübəhat”, ۱۴“ . [۲] -۲

.Həmin”, ۱۴“ . [۳] -۳

deyəcək: bəli, ibadətdir və əslində ibadətin əsası dua və çağırmaqdır. Bu zaman ona de: İndiki, çağırmağın ibadət olmasını təsdiqləyirsən və özün də gecə və gündüz, qorxu, ya ümid üzündən, Allahı çağırır və hacət istəyirsən və eyni halda, həmin hacətdə peyğəmbəri ya ondan qeyrisini də çağırır və ondan istəyirsən, Allahın (ibadətində, Allahdan qeyrisini şərik qərar verməyibsənmi?(١)

Bu istidlalın xülasəsi məntiqi müqayisə ilə belədir: Dua etmək və hacət diləmək, ibadətdir. Allahdan qeyrisinə ibadət şirkdir. Buna əsasən Allahdan qeyrisindən hacət .istəmək və sığınmaq şirkdir

:Sonra məsələnin ardınca deyir

Həmçinin ona de: Quranın pislədiyi müşriklər, mələkləri, salehləri, latı və onlardan" :qeyrilərini pərəstiş etmirdilərmi? Çarəsiz qalıb, bəli deyəcək. Bu vaxt de

Məgər onların mələklər, salehlər və lat qarşısındakı ibadətləri, dua, qurban kəsmək və sığınmaqdan başqa bir şey idimi? Onlar da inanırdılar ki, Allah bəndələri olub və onun əmri altındadırlar. Allahın işləri tədbir etməsinə etiqadlı idilər. Amma onlar üçün etiqadlı olduqları məqama görə onları çağırır, onlara pənah gətirir və onlardan şəfaət (istəyirdilər".(٢)

:Beləliklə, o zaman ki, biz, Peyğəmbər (s) və İmam (ə)-a ərz edirik

Ey Allahın Rəsulu!" Ey mənim ağam və rəhbərim! Qiyamət günündə mənə şəfaət et"." Ya bu dünyada bir hacət istəyirik. Bunların hamısı çağırmaq və duadır, halbuki, ayə bu :işi qadağan edib, buyurmuşdur



---

.Qafir", ۶٠" .[١]-١

.(Kəşfuş - şübəhat", ١۴ - ١۵ və "Kəşful - irtiyab", ٢٣٠ (bir az fərqlə" .[٢]-٢

{فلا تدعوا مع الله احدا}

"_!Allahdan başqa heç kəsə ibadət etməyin_"

**?Cavab: Hansı dua qadağan olmuşdur**

Cavab verməmişdən öncə,"dua"nın nə demək olduğunu bilməliyik. Duanın bir ümumi və lüğət mənası və bir xüsusi və ürfi mənası var. Duanın lüğət mənası "nida etmək və çağırmaq"-dır. Quranda da "dua" neçə yerdə bu mənada işlənmişdir. O cümlədən, :Həzrət Nuh (ə) –un dilindən bu şərif ayə

{رَبِّ إِنِّى دَعَوْتُ قَوْمِى لَيْلًا وَنَهَارًا، فَلَمْ يَزِدْهُمْ دُعَائِى إِلَّا فِرَارًا}

_!Ey Rəbbim! Mən qövmümü gecə-gündüz (imana, haqq yola)__ __dəvət etdim_"

Lakin dəvətim onların (imandan) qaçmalarını daha da artırmaqdan başqa bir şeyə (yaramadı".(١)

Biz də öz ürfümüzdə deyirik: Filankəs məni dəvət etdi. "Dəvət" dua kəlməsindəndir. Ya deyirik ki: O məni çağırdı, ya istədi. Qonaqlığa, müsahibəyə, mühazirəyə, ya :mübahisəyə dəvət etdi. Bunların hamısı duadır. Quran başqa bir ayədə buyurur

{لا تجعلوا دعا ء الرسول بينكم كدعاء بعضكم بعضا...}

(Öz aranızda bir – birinizi çağırdığınız kimi, Peyğəmbəri çağırmayın_".(٢)_"

Yəni hər vaxt Peyğəmbəri (s) çağırsanız, bir – birinizi çağırdığınız kimi, çağırmayın, əksinə onu hörmətlə çağırın. Belə istifadə, yəni səs və nida, qətiyyən ibadət deyil. .Camatın bir- birindən hacət istəməsi də duadır, amma ibadət deyil

Dua" kəlməsi, "sual" mənasında da işlənmişdir. Rağib"



---

.Nuh", ٥ - ٦" . [١]-١

.Həmin", ٦٣" . [٢]-٢

:dua”-nın mənalarının ardınca, oxuduğumuz ayəni zikr edəndən sonra deyir“

{ودعوته اذا سالته و اذا ا ستغثته}

(Onu çağırdın, o zaman ki, bir kəsdən sual ya kömək istəmiş olsun_”.(۱_“

yəni onu çağırdım”. Nalə və yalvarışla bir şey istəmək də belədir. Siz ”دعوته“ :Demək olar bir kəsin ətəyindən yapışıb, deyirsiniz: “Xahiş edirəm bu işi mənim üçün yerinə yetir”. Yaxud yalvarırsız ki: “Bu işə qarışma, ya güzəşt et”. Bu yalvarışdır, lüğət cəhətdən .duadır, amma ibadət deyil

Deməli, mütləq istəmək, nida etmək, səsləmək, sual etmək, nalə və zarlıqla yanaşı olan yalvarışa şamil olur, hamısı çağırmaq və duadır, lakin ibadət deyil. Belə olmasa, .onda gərək deyək, Həzrət Nuh (ə) öz tayfasına ibadət edibdir

Dua”nın lüğət mənasından başqa da, xüsusi bir mənası var ki, bu mənada dua ibadət“ sayılır. İnsan yaradan və ruzi verən Allahın qarşısında dayanır və yalnız onu yaradan və işləri tədbirə salan əqidəsilə çağırır və ondan hacət istəyir. Allahdan istəmək o kəs qarşısında təvazö və zəlillikdir ki, yaradan və ruzi verəndir, aləmin rəbbi və tədbir edənidir. Bu dua ibadətdir, amma hər bir dua ibadət deyil, əksinə duanın qisimlərindən bəzisi ibadətdir və o, insanın öz xaliqi, ruzi verəni, tədbirə salanı və Allahı qarşısında, .təvazö və zəlilliklə etdiyi bir duadır

Bütpərəstlər bütlərin qarşısında, müşriklər də məbudlarının qarşısında dua edirdilər. .Onların duaları ibadət idi. Çünki büt və məbudu “Allah” bilirdilər



---

.Müfrədat”, ۱۷۰“ .[۱]-۱

## İMAMLAR (ə) – DAN ŞƏFAƏT İSTƏMƏK VƏHHABİLƏRİN NƏZƏRİNDƏ

### İşarə

Vəhhabilərin nəzərinə görə Peyğəmbər (s), imamlar (ə) və Allahdan başqa, hər bir mövcuddan şəfaət istəmək və təvəssül etmək, şirk və haramdır. Onlar bu məsələni isbat etmək üçün,

“Allahdan başqa heç kəsə ibadət etməyiın”(١) şərif yəsinə istinad edib deyirlər:

{فلا تدعوا مع الله احدا}

“Hər bir dua və çağırmaq ibadətdir. Əgər dua Allahdan qeyrisi üçün olsa, onu pərəstiş etmək mənasınadır və ona görə də şirkdir.

### Duanın mənalarına yenidən bir baxış

Dediyimiz kimi, “dua və çağırmağın” iki mənası var: Biri ümumi məna və o biri xüsusi məna. Duanın ümumi mənası budur ki, insan bir kəsi çağıra, səsləyə və ya sual verə. Amma duanın xüsusi mənası, hansı ki, o mənada,



---

١- [١] . “Cin”, ١٨.

ürfi həqiqət” olmuşdur, təvəssül etmək, hacət istəmək və çağırmaqdır ki, biz uca Allah“ .üçün, həmçinin hər kəs öz Allahı və məbudu qarşısında yerinə yetirir

.Bütpərəstlər də, bütlərin qarşısında belə dua edirlər

Duanın ikinci mənası, onun ikinci dərəcəli mənasıdır. Hər vaxt siz desəniz: dua etmək istəyirik, “səhər duası”, “gecənin əvvəlinin duası” və bundan qeyri ibarələr işlədirsiz, “dua” kəlməsini, onun ikinci mənasında işlətmisiniz. Bu işlətməyin iki ehtimalı var: Ya kullini öz əczalarından (hissələrindən) birinə şamil etmək cəhətindəndir. Çünki dua xüsusi mənada da, lüğətdəki duanın əczalarından sayılır. Ona görə ki, hər bir halda çağırmaqdır”. Allahummə inni əsəlukə” nidadır, “Ya Allah, ya Allah, ya Allah” nidadır. Həmçinin belə demək olar: “Dua” kəlməsi ikinci mənada (ibadət mənasında) çox işləndiyi üçün, ibadət onun ikinci mənası olaraq qəbul edilmişdir. Çünki ibadət bir iş, ya sözdür ki, onda bir mövcud qarşısında son dərəcə təvazö və zəlillik olsun ki, insan onu .malik, rəbb və tədbir edən bilir

Rəvayətlərdə gəlmişdir ki, “Əd-dua hiyəl ibadə”(١) (Dua eyni ibadətdir) ya “Əd-dua (moxxulibadə”(٢

Dua ibadətin beynidir), məqsəd bu növ duadır. Sizin oğlunuzu səsləməyiniz isə ibadət) :deyil. Həzrət Nuh (ə) da deyir

Rəbbi inni dəvtu qəvmi”. Mənası bu deyil ki, öz tayfasına ibadət etmişdir. Doğrudur,” .tayfasını çağırıb, amma hər çağırmaq ibadət deyil, bəzi çağırmalar ibadətdir

Beləliklə, demək lazımdır ki, “Fəla təd’u məllahi



---

.Biharül - ənvar”. C, ٩٣, s ٣٠٠“ . [١] -١

.”Həmin“ . [٢] -٢

əhəda” ayəsinin mənası budur; Allahı çağırıb, ibadət duası yerinə yetirib və raz – niyaz etdiyin kimi, digərini çağırma. Bu söz doğrudur. Ona görə ki, heç vaxt Allahı .səslədiyimiz kimi, Allahdan qeyrisini səsləməməliyik

Biz Allahı, iradə etdiyi hər bir şeyin faili, ruzi verəni və xaliqi bilirik. Ondan istəyir, Onu çağırır və Onun qarşısında təvazö və zəlillik edirik. Amma Allahdan qeyrisinin .qarşısında (kim olursa olsun) bu işi etməməliyik

**Şəfaət istəmək,birinci mənadakı duadır**

Buna əsasən, ayənin qadağası, ibadətdən qeyri çağırmağa, yəni adi sual və nidaya şamil olmur. Biz Peyğəmbər (s) – dən istəyib, desək; “Ey Allahın Rəsulu! Mənə şəfaət et”. Bu ümumi mənadakı çağırmaq və duadır. Lakin ibadət duası olan, xüsusi mənadakı çağırmaq və dua deyil. Bu sizin dediyiniz kimidir ki, “Ey Zeyd! Filan işi mənim üçün yerinə yetir”. Bunlar dua olub, ibadət olmadığına görə “Fəla təd’u məllahi əhəda ” ayəsi .ona şamil olmur

Mübarək ayədəki “məllah” kəlməsi, bu mənanı çatdırır ki, Allahı çağırdığınız kimi, heç kəsi çağırmayın. Malik, rəbb və tədbir edənə etiqad etməklə, təvazö, kiçiklik və .zəlilliklə yanaşı çağırmaq, Allaha məxsusdur

Bütpərəstlər, bütü təvazö halında, rəbb və Allah olmalarına etiqadla çağırır və dua edirdilər. Onları belə dua etməkdən çəkindirən, çoxlu ayələrimiz var. Bu ayələrin özü, bütpərəstlərin bütləri, ruzi və bərəkət mənşəyi və tədbir mənşəyi və s…, bilmələrinə və .onlardan hacət istəmələrinə dəlildir

:Biz burada həmin ayələrdən bəzisinə işarə edirik

{وَالَّذِينَ تَدْعُونَ مِن دُونِهِ لاَ يَسْتَطِيعُونَ نَصْرَكُمْ وَلآ أَنفُسَهُمْ يَنْصُرُونَ}

Sizin Ondan başqa tapındıqlarınız isə nə sizə, nə də özlərinə bir köməklik edə_“ (bilər!_”.(١

Bu ayədən onların bütlərdən kömək istəmələri başa düşülür, əks halda, ayənin bu .əməli inkar edib, pisləməyinin mənası olmazdı

{إِنَّ الَّذِينَ تَدْعُونَ مِن دُونِ اللّهِ عِبَادٌ أَمْثَالُكُمْ}

(Allahdan başqa ibadət etdiyiniz bütlər də sizin kimi bəndələrdir_”.(٢_“

Yəni sizin öz ehtiyaclarınızı yerinə yetirməyə qüdrətinizin olmadığı kimi, onlar da sizin .hacətlərinizi yerinə yetirə bilməzlər

{وَالَّذِينَ تَدْعُونَ مِن دُونِهِ مَا يَمْلِكُونَ مِن قِطْمِيرٍ}

(Sizin Ondan qeyri ibadət etdikləriniz bir çəyirdək qabığına belə sahib deyillər._”.(٣_“

{لَهُ دَعْوَةُ الْحَقِّ وَالَّذِينَ يَدْعُونَ مِن دُونِهِ لاَ يَسْتَجِيبُونَ لَهُم بِشَيْءٍ}

Haqq olan (qəbul edilən) dua yalnız Ona (Allaha) olan duadır. Ondan başqasına_“ edilən dualar (Ondan qeyrisinə ibadət edənlərin duaları) qəbul olunmaz (bütlər, (tanrılar onların dualarını əsla eşitməzlər)_”.(۴

{وَلاَ تَدْعُ مِن دُونِ اللّهِ مَا لاَ يَنفَعُكَ وَلاَ يَضُرُّكَ}

Allahdan başqa, sənə nə bir xeyir, nə də zərər verə bilən şeylərə (tanrılara və_“ (bütlərə) ibadət etmə!_”.(۵

Bu ayədən, Allahdan qeyrisini çağıranların məqsədlərinin, hacət istəmək və mənfəət .əldə etmək, ya zərəri aradan qaldırmaq olması məlum olur

{وَمَنْ أَضَلُّ مِمَّن يَدْعُو مِن دُونِ اللَّهِ مَن لَّا يَسْتَجِيبُ لَهُ إِلَى يومِ الْقِيَامَهِ}

١- [١]. “Ə`raf”, ١٩٧.

٢- [٢]. “Həmin”, ١٩۴.

٣- [٣]. “Fatir”, ١٣.

۴- [۴]. “Rə`d”, ١۴.

۵- [۵]. “Yunis”, ١٠۶.

Allahı qoyub qiyamətədək özünə cavab verə bilməyən bütlərə ibadət edən_“ (kimsədən daha çox (haqq yoldan) azmış kim ola bilər?!_”.(١)

{قُلِ ادْعُواْ الَّذِينَ زَعَمْتُم مِّن دُونِهِ فَلاَ يَمْلِكُونَ كَشْفَ الضُّرِّ عَنكُمْ وَلاَ تَحْوِيلاً}

De: “_(Allahdan) başqa tanrı güman etdiklərinizi (köməyə) çağırın. Onlar sizi nə“ möhnətdən qorumağa, nə də onu dəyişməyə (sizdən sovuşdurub başqasına tərəf (yönəltməyə) qadir deyillər!_”.(٢)

Bu ibarə, onların bütlərdən zərər və giriftarlığı aradan götürməyi istəmələrini və bütləri öz Allahları düşünən halda, onlara ümidvar olduqlarını göstərir. Əgər onlar hacətlərini və zərəri uzaqlaşdırmağı və mənfəəti istəməsəydilər, yalnız “bizə şəfaət et, ya bizim üçün dua et”, desəydilər, bu ayənin cavabında deyərdilər: İlahi! Biz ki, .bütlərdən giriftarlığı aradan götürməyi, ya mənfəət əldə etməyi və hacət istəmədik

Əlbəttə, burada avam camaatın nadanlıq üzündən elədiyi bəzi işlər barəsində, izah :vermək lazımdır

Arabir bəzi şəxslərin, ağac budağına parça, ya başqa şeylər bağlamaları və ağacdan hacət istəmələri ilə rastlaşırıq. Əgər bu işi diqqət və bilərəkdən yerinə yetirsələr, ağacdan heç bir xeyir və zərərin onlara yetişmədiyini nəzərə alaraq, bunların işinin bütpərəstlərin işi kimi olduğunu demək lazımdır. Amma bir kəs Allah övliyalarından birinə (ə), ya Allah dərgahına yaxın olan bir saleh insana təvəssül etsə və avam ruhuna görə təvəssülün kənarında, zərihə, ya başqa yerə qıfıl da bağlasa, lakin həqiqətən ,nəzəri budur ki, o, onun üçün dua edə, nəinki



---

.Əhqaf”, ۵“ .[۱]-۱

.İsra”, ۵۶“ .[۲]-۲

öz hacətini zərihdən, ya başqa şeylərdən istəyə, belə təvəssülün eybi yoxdur. Amma yalnız daşdan, ya taxtadan, yaxud ağacdan öz hacətini istəsə, bunların xeyir və ya .zərər yetirmədiyini nəzərə alaraq, bu iş bütpərəstlərin işinə oxşayacaq

Hər halda, bütpərəstlərin əksinə olaraq, bizim Peyğəmbər (s)-ə və Allah övliyalarına təvəssülümüz, həmçinin onlardan dua, şəfaət və hətta hacət istəməyimiz bu mənadadır ki, onlar vasitə olsunlar. Allahdan bizim hacətimizi yerinə yetirməyi, Allahın bizim duamızı qəbul etməsini, Allahın Peyğəmbər (s)-in şəfaətini bizim haqqımızda qəbul etməsini diləmək, bu istəmələrin hamısı Allaha qayıdır, lakin ondan istəyirik ki, ."“sən istə

Möminlərdən və salehlərdən, diri olduqları zaman hacət istəmək və dua etmək, vəhhabilərin özünün, o cümlədən ibn Teymiyyənin qəbul etdiyi məsələdir. Digər .sözlərində də gəlmişdir ki, Allah istəsə, sonradan danışacağıq

Deməli, ayənin qadağan etdiyi yer, ibadət halında olan duadır. Bu məsələni ayənin əvvəlində gələn ibarə də təsdiqləyir. Əvvəlcə buyurur: “Və ənnəl məsacidə lillah” sonra təfri (bir - birindən ayırma) fa – sı vasitəsilə buyurur: “Fəla təd’u məəllahi əhəda” yəni Məscidlər Allaha məxsus olduqlarına görə, məsciddə Allahla yanaşı başqa birisini çağırmamalısınız. Bu ayə demək istəmir ki, Məscidlərdə bir - birinizi səsləməyin və . ...hətta deməyin: Cənab! Mənə su ver, çay gətir, səccadəni gətir və

Məscidlərdə qadağan olunan budur ki, Məscidlərdə Allahdan başqa, digər bir varlığı ,ibadət formasında dua edib və çağırmaq olmaz. Yəni Allahdan istədiyi kimi

həmin etiqadla Allahdan qeyrisindən istəməməlidir. Çünki “La təd’u məllah” ayəsi ona .şamil olur

Ey Allahın Rəsulu mənim üçün bağışlanmaq_“ {يا رسول الله استغفرلى} :Amma əgər desə .istə_”. Bu yalnız xahişdir və qətiyyən ibadət deyil. Bu “mənə su ver” deyən şəxs kimdir

Deməliyik ki, bu ayədə “Məscidlər” kəlməsinin zikr olması yalnız məscidlərdə Allahdan qeyrisini çağırmağın qadağan olması və məscidlərdən başqa yerdə maneçiliyin olmaması mənasında deyil, əksinə çox vaxt dua və ibadətin məsciddə baş verdiyinə .görə “Məscidlər” kəlməsi işlənmişdir

**Mübarək “Və ənnəl məsacidə lillah” ayəsi üçün başqa məna**

Ayə üçün deyilən mənadan başqa, digər bir məna da Həzrət Cavad (ə)-dan rəvayət olub. Əllamə Təbatəbai onu Səid bin Cübeyrdən və səhabənin bəzi tabeinlərindən bu məzmunla nəql ediblər:(١) Mötəsim Əbbasi, alimlərdən təşkil olunan və iman Cavad (ə) - ın da hazır olduğu bir məclisdə, bu sualı verdi ki, oğrunun əlini harasından kəsmək lazımdır? Əvvəlcə ordakı alimlər cavab verməyə başladılar: Biri dedi: dirsəkdən .kəsmək lazımdır. Digəri dedi: Biləkdən kəsmək lazımdır və hərəsi bir şey dedilər

Bu zaman İmam Cavad (ə) buyurdu: “Əlin barmaqlarını kəsmək və əlin içini saxlamaq .”lazımdır

Onlar Həzrətdən dəlil istədikləri vaxt, o Həzrət buyurdu: Allah Rəsul buyurub: Səcdə ,yeddi üzvlədir: alın



---

.Təfsiri-mizan, c. ٢٠, s ٥٠. Cin surəsinin ١٨ – ci ayəsinin davamında . [١] -١

iki əlin içi, iki diz və ayağın iki böyük barmağı. Əgər onun əlini biləkdən ya dirsəkdən kəssəniz, onun üçün səcdə etməyə bir əl qalmaz. Allah taala da buyurub: "Və ənnəl məsacidə lillah fəla təd'u məəllahi əhəda". Allaha məxsus olan şey kəsilməz.

Mötəsim bu sözdən sevindi və oğrunun əlini barmaqların ələ birləşdiyi yerdən kəsilməsini əmr verdi.(۱)

Bu rəvayətdə, İmam Cavad (ə) ayədəki "məscid" kəlməsini, səcdədə yerə qoyulan yeddi üzv mənasında təfsir etmişdi.

Bu mənanın aydın olması üçün, diqqətlə şərif ayəyə baxdıqda, səbəbləndirmə və nəticə almanın olduğunu görürük. Ayənin birinci hissəsi səbəbləndirmə, ikinci hissəsi isə nəticə almadır. Səbəbləndirmə və nəticə almanı bir–biri ilə əlaqələndirmək üçün, belə məna etməliyik: Səcdə yerləri Allahındır və buna görə də səcdə və ibadət Allahdan başqası üçün yerinə yetirilməməlidir. Çünki (...Fəla təd'u...) xüsusi dua mənasındadır, yəni bir növ ibadətdir. Ona görə də səbəbləndirməyə, bu nəticə alma əlavə olubdur. İmam Cavad (ə) – ın təfsirinin ayənin təvili olması mümkündür, nəinki onun zahiri mənası və təfsiri.

Təfsir alimlərinin çoxu da duanı bu ayədə "ibadət" mənasında tutblar. Fərq eləməz, istər "məsacid" kəlməsini "məscid" - in cəmi bilək (necə ki onların çoxu belə deyiblər) və istər səcdə yerləri mənasında. Biz dedik ki, "təd'u" dua mənasındadır, lakin ibadət olan bir dua, amma təfsirçilər əsasən "la tədu" – nu "la tə`budu" mənasında tutublar.



---

۱- [۱]. Vəsailuş-şiə, c. ۱۸, s ۴۹۰, h ۳۴۶۶۵.

Bu barədə Əlmənarın təfsirçisi, “İnnəlləzinə təd’unə min dunillahi ibadun əmsalukum”(1) ayəsinin ardınca deyir:

“Dua, ibadətin özəyi, əsası və böyük sütunudur. Deməli, yalnız Allahı çağıran və Onunla yanaşı başqasını çağırmayan şəxsin tövhidi doğrudur. Necə ki, Allah buyurur: Allahla yanaşı heç bir kəsi çağırmayın və dua etməyin. Təfsirçilər də deyirlər: Dua belə ayələrdə ibadət mənasındadır və bu kullun cüzün adıyla adlandırılması qəbilindəndir. Ona görə də təfsirçilər “tədunə” kəlməsini “tə`budunə” – yə (çağırmayın kəlməsini, pərəstiş etməyin kəlməsinə) təfsir edirlər”.(2)

Beləliklə, təfsirçilərin təfsirinə əsasən, ayənin mənası budur ki, Allahla yanaşı, Allahdan qeyrisinə ibadət etməyin. Amma Əlmənar təfsiri bu mənanı qəbul etmir və deyir: “tədu” xüsusi mənada olan dua etməkdir, yəni ibadət duası və insanın Allah qarşısında yerinə yetirdiyi dua mənasındadır. Bu düz sözdür. Çünki məşhur məna, zahiri mənanın əksinədir. Zahiri məna budur ki, “la tədu” yəni dua etməyin, məqsəd duanın ikinci qismi, yəni ibadət duasıdır, nəinki mütləq dua, hətta səsləmək və nida etməyə də şamil olmur. “La təd’u” “la tə`budu” mənasındadır deməklə, öz mənasında olur, yəni duadır, lakin ibadət halında olan bir duadır, deməli arasında fərq var.

### Dua və ibadətin müqayisəsi

Dua və ibadəti müqayisə etdikdə, onların arasında məntiqi baxımdan bir sıra oxşar və bir sıra özünəməxsus xüsusiyyətlər müşahidə edirik. Yəni dualardan bəzisi



---

1- [1]. “Ə`raf”. 194.

2- [2]. “Əlmənar”, c. 9, s 527.

ibadət deyildir. Məsələn bir-birimizi dəvət edirik, səsləyirik, hacət istəyirik, hətta Peyğəmbər (s), imam, övliya və mələkləri də bu formada çağırmaq duadır, lakin ibadət .deyil

Şəfaət və təvəssüldə, biz Peyğəmbər (s)-i çağırırıq, hətta təkid, yalvarış və zəlillik də edirik, amma onu rəbb və müstəqil təsir sahibi, malik və Allah bilmirik. Ona görə də .ona ibadət etmirik

Bəzi ibadətlərimiz var ki, onlarda dua yoxdur. Xüms və zəkatı ödəmək ibadətdir, yəni qürbət qəsdi onda şərtdir, lakin onda dua yoxdur. Səcdənin özü ibadətdir, hətta insanın bir şey demədən, Allahın ilahilik və rəbbliyinə etiqadla torpağa baş qoyması, ibadətdir. Əlbəttə, hər səcdə də ibadət deyil. Mələklərin Həzrət Adəm qarşısında etdikləri səcdə ibadət deyil. Əks halda, “fə səcədu illa iblis”(۱) ayəsinə əsasən, İblisdən başqa, bütün mələklərin müşrik olmalarını demək lazımdır. Yəqubun, arvadının və övladlarının, Yusif qarşısındakı səcdəsi, Yusifə ibadət deyildi, əks halda onların hamısının müşrik olmalarını (Allaha sığınırıq) demək lazımdır. Aydındır ki, Allah peyğəmbəri Yəqub (ə) Allahdan qeyrisinə ibadət etməz. Ona görə də, hər bir səcdə ibadət deyil və yalnız onu Allah və İlahi sanaraq onun üçün səcdə etsələr, ibadət .olacaq

Bəzən də bir əməl, həm ibadətdir və həm dua. Namaz kimi, həm duadır və həm də ibadət. Ya da dua ilə yanaşı olan səcdə kimi. Həmçinin, insanın Allah qarşısında .oxuduğu dua

La təd’u” da duanın xüsusi mənasında qadağan“



---

.Bəqərə”, ۳۴“ .[۱]-۱

olunması məsələsi barəsində, başqa şahid və sübutlar var. O cümlədən, Qurandan oxuduğumuz və müşriklərin pislənməsinə aid olan ayələr. O ayələrin çoxunda “dua və dəvət” maddəsindən olan müxtəlif ibarətlər var idi. Əgər bu ayələrə diqqət etsək, (orada da duanın xüsusi mənasında nəzərdə tutulduğunu görərik.(۱

Bu ayələrin hamısında, qadağan və ya pislənən dua, həmin ibadət mənasında olan duadır. Hansı ki, Allah-taaladan başqa bir mövcudun qarşısında təvazö və zəlilliklə .yanaşı ola

səh:۶۹

---

.Fatir”, ۱۹. “Yunis”, ۱۰۶. “Ən`am”, ۷۱. “Maidə”, ۷۶“ . [۱]-۱

**İşarə**

Vəhhabilərin Allah Rəsulu (s) – dən və Allah övliyalarından dua və şəfaət istəmək barəsində olan iradlarını açıqladıq və bəhs tamamlandı. İndi Peyğəmbər (s)–ın zamanında, ya Həzrətdən sonra, O Həzrətdən, ya digərlərindən şəfaət istənilən yerləri araşdırdıq. Bu yerlər, çoxdur. Biz bu məsələnin heç vaxt Peyğəmbər (s)–in əshabı, tabein, həmçinin tabeinlərin tabeinləri və digər müsəlmanlar üçün irad formasında olmamasının məlum olması üçün, onlardan yalnız bir neçəsini açıqlayırıq. Vəhhabilərin "bu əməlin qadağan olmasına icma var" iddiaları doğru deyil. Bu məsələ .İbn Teymiyyənin zamanından sonra, irad formasında açıqlanmışdır

Bu məsələni iki dövrə bölüb araşdırırıq: Biri Peyğəmbərin həyatı zamanı və digəri Həzrətdən sonrakı zaman. Həmçinin "dua və şəfaət istəməyin Həzrətin zamanı ilə, Həzrətdən sonrakı dövrü ilə fərqi var, ya yox?" sualına cavab vermək üçün bəhsə .başlayacağıq

## Peyğəmbər (s) – in həyatı zamanı dua istəmək

Diri olarkən dua istəmək o qədər də bəhs olunmur. Onlar da bunu qəbul ediblər, istər .dünya ehtiyacları üçün, istərsə də axirət ehtiyacları üçün

.”İbn Teymiyyə deyir: “Diridən dua istəmək olar və maneçiliyi yoxdur

Mərhum seyid Möhsin Əmin, İbn Teymiyyənin ziyarətul-qubur məqaləsindən nəql :edir

Peyğəmbər (s) - dən rəvayət var: Hər kəs öz qardaşının arxasınca dua etsə, Allah bir “ mələkə tapşırar ki, dua edənə desin: Bu xeyir duası, sənin özün üçün də olsun. Həmçinin deyir: İnsanın qaib şəxs üçün dua etməsi caizdir və ona görə də Peyğəmbər (s) ona salavat göndərməyi və Allahın ona vəsilə məqamını verməsin istəmələrini, əmr (buyurdu”.(١

Deməli, Peyğəmbər (s)-in özü dua etməyə və dua istəməyə əmr etmişdir. Peyğəmbər (s) - ə salavat göndərmək də, Peyğəmbər (s) və onun əhli beytinə dua etmək və rəhmətin nazil olmasını istəməkdir. Peyğəmbər (s) əmr buyurub, ona salavat göndərək və rəhmət istəyək. Həmçinin vəsiləyə yetişmək üçün dua etməyi bizdən .istəmişdir

Vəsilə, behiştdə bir məqamdır ki, Allah onu insanlar içində yalnız bir nəfərə bağışlayar və onun kimliyi məlum deyil. Ona görə Peyğəmbər (s) o məqamı Ona bağışlamağı .Allahdan istəmələrini, öz ümmətinə əmr edib və onlardan istəmişdir

Allah Rəsulu (s)-in ziyarətnaməsində, həm sünnilərin

səh:٧٢

---

.Ziyarətul qubur, məqaləsi, s ١٥٥. Kəşful irtiyabdan nəql olunaraq, s ٢٣٥ . [١] -١

arasında, həm də bizim aramızda, bu məzmunla təbirlər var ki, O Həzrəti ziyarət :edəndə deyirik

."İlahi! Öz Rəsuluna vəsilə məqamını mərhəmət buyur «واعطه الوسیله»

İbn Teymiyyə deyir: "Çünki peyğəmbər (s) dua edib, ona görə də, bir kəs insandan dua etməsini istəsə, onun duasını qəbul etmək və onun üçün dua etmək olar". Sonra rəvayət nəql edir ki, Peyğəmbər (s) buyurdu: "Azan verənin səsini eşitdiyiniz vaxt, onunla azanı təkrar edin və sonra mənə salavat göndərin ki, hər kəs bir dəfə mənə salavat göndərsə, Allah on dəfə ona salavat göndərəcək. Bu zaman Allahdan mənim üçün vəsilə məqamını istəyin, hansı ki, behiştdə bir dərəcədir ki, Allah bəndələrindən yalnız birinə verilər. Mən o şəxs olmağıma ümidvaram. Hər kəs mənim üçün Allahdan (vəsiləni istəsə, mənim şəfaətim qiyamət günündə ona şamil olacaq"(١

İbn Teymiyyə bir neçə rəvayət nəql edəndən sonra deyir: "Həmişə aşağı insanların, özlərindən yuxarılardan dua istəmələri lazım deyil, yuxarı insanlar da özlərindən aşağılardan dua istəyə bilərlər". Bu barədə bir neçə hadisəni nəql edir, o cümlədən :deyir

Özündən yuxarı və aşağıdan dua istəməyin hər ikisi caizdir. Çünki Peyğəmbər (s)" ömrəyə yola düşən Ömərlə vidalaşan vaxt buyurdu: Ey qardaş! Bizi dualarında (unutma".(٢

Səhih hədisdə gəlmişdir ki, Peyğəmbər (s) bir dəfə, Oveys Qərəni barəsində söhbət" edən vaxt, Ömərə buyurdu: Oveys Qərəninin sənin üçün istiğfar etməsinə



---

.Həmin, ١٥٥ . [١]-١

.Həmin . [٢]-٢

(görə bir iş etmək istəsən, bu işi gör”.(١)

Bu istəmək dua, hətta şəfaət istəməkdir. Çünki istiğfar istəməyin özü, bir növ dua və şəfaət istəməkdir.

Məsələnin ardınca deyir:

“Səhih Müslim və səhih Buxaridə gəlmişdir ki, Əbu Bəkr və Ömərin arasında, ixtilaf baş verdi. Əbu Bəkr Ömərə dedi: Mənim üçün istiğfar et”.(٢) Həmçinin həmin iki kitabda nəql olmuşdur: Camaat bir zaman quraqlıq və susuzluğa düçar oldular. Peyğəmbər (s)-in xidmətinə gəldilər. Həzrətin onlar üçün Allahdan su və yağış istəməsini istədilər. Peyğəmbər (s) dua buyurdu, Allah yağış göndərdi və camaat sirab oldu”.(٣)

**Peyğəmbər (s) diri olarkən, ondan şəfaət istəmək**

Bu dəlillərlə, diri şəxsdən dua istəməyin müzakirə olunmaması və heç bir iradın olmaması isbat olur. Şəfaət istəmək necə? Olarmı?

Əvvəlcə bilmək lazımdır, şəfaət istəməyin mənası nədir? Yəni bir şəxs “Ey Allah Rəsulu mənə şəfaət et” deyən zaman məqsədi nədir? Camaat arasında (ürfi məna), şəfaətin mənası budur ki, məsələn, bir nəfər günah və pis iş görüb və başqa bir şəxs, onun ağası və böyüyünün yanında vasitə olur və ondan pis iş göreni əfv etməsini istəyir.

Şəfaət istəməyin də ürfi mənası budur ki, məsələn



---

١- [١]. Həmin.

٢- [٢]. “Səhih Buxari”, c ۶, s٧۵.

٣- [٣]. Həmin, c. ٢, s ٣٣ – ٣٨. Bab.(əl-istisqa) Camaatın quraqlıq zamanı imamdan yağış yağması üçün, dua etməsini xahiş etmələri; Bab. əl-istisqa came məscidində. Bab. əl-istisqa cümə xütbəsində; Bab. əl-istisqa minbər üzərində. Bab. İstisqada cümə namazı ilə kifayətlənən şəxs. Bab. Yolların yağış nəticəsində bağlandığı zaman (açılması üçün) dua etmək.

üçüncü şəxsin yanına gedirlər və deyirlər: Mən günah və pis iş görmüşəm, başçım, ya başqa bir nəfər mənə etinasız və məhəbbətsiz olub, maaşımı kəsib, ya məni çıxarmışdır, xahiş edirəm, mənim günahımdan keçib və ondan göz yumması, mənim .çətinliyimi həll etməsi üçün, siz onun yanında vasitəçi və şəfaətçi olun

Ümumi camaatın fikrində şəfaət istəmək, həmin dua və hacət istəməkdir, yəni vasitə .olmasını və dua etməsini istəyir. Dua da istəməkdən başqa bir şey deyil

**Şəfaətin forması**

Əlbəttə, "qiyamət günündə şəfaətin həmin dua, ya duadan əlavə başqa bir şey olması" məsələsi, ayrı bir bəhsdir. Şəfaətin duadan əlavə bir şey olması deyilməsi mümkündür. Məsələn: Təsəvvür edin ki, Allah Rəsulu (s), ya Allah övliyaları (ə) əvvəlcə dua etsinlər, Allahdan istəsinlər və Allahın izni və icazəsindən sonra, Peyğəmbər (s) və Allah vəlisi .(ə) günahkar şəxsdə dəyişiklik yaratsınlar

Bəzi rəvayətlərdə də gəlmişdir ki, Peyğəmbər (s) bəzi şəxsləri "kövsər suyunda" paklayar. Lakin orada kövsər suyunun necə olması və bu paklamanın necə yerinə yetirilməsi bizə aydın deyil. Çirkli paltarı yuyub, təmiz etdikləri kimi, bəlkə şəfaətçi şəfaət istəyən günahkar şəxs barəsində yuyulma işi kimi bir iş yerinə yetirir. Əvvəlcə dua edib və Allahdan istəsin. Bu zaman Allah izin versə, Allahın nemətlərinə və .bağışlanmağa layiq olması üçün, bir əməli şəxsin barəsində yerinə yetirsin

Bəhs indi bu barədə deyil, əksinə şəfaətin camaat arasında hansı mənada .olmasındadır. Camaatın şəfaətdən həmin vasitə, dua və istəməyi anladıqlarını dedik

İbn Teymiyyə əgər dua və istəməyi düz bilib, qəbul edib və hətta bu barədə bəzi rəvayətlərə istinad edibsə, şəfaət istəməyi də doğru bilməlidir. Çünki şəfaət istəmək, dua istəmək və vasitəçilikdən başqa bir şey deyil. Qeyd etdiyi rəvayətlərdə də həmin məsələ gözə çarpır. Məsələn: Peyğəmbər (s) Allahın ona behiştdəki xüsusi dərəcəni verməsi üçün, müsəlmanlardan onu dua etmələrini istəməsi, dua istəməkdir. Bunun bir şəxsin peyğəmbərdən onu dua etməsini istəməsilə heç bir fərqi yoxdur, hər ikisi .icazəli və iradsızdır

**Başqa neçə nümunə**

Ələttə biz hələ diridən dua və şəfaət istəməyə dair bəhs edirik, lakin diri və ölüdən dua və şəfaət istəməyin caizliyinə (qeyd edilənlərdən əlavə) başqa dəlillər də varımızdır. O :cümlədən, Quran buyurur

{وَلَوْ أَنَّهُمْ إِذ ظَّلَمُواْ أَنفُسَهُمْ جَآؤُوكَ فَاسْتَغْفَرُواْ اللّهَ وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُواْ اللّهَ تَوَّابًا رَّحِيمًا}

Onlar(münafiqlər) özlərinə zülm etdikləri zaman, dərhal sənin yanına gəlib Allahdan_“ bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə Allahın (tövbələri qəbul edən və mərhəmətli olduğunu bilərdilər_”.(١)

Bu ayədən, müsəlmanların Peyğəmbər (s)-in yanına gəlib, onlar üçün bağışlanmaq istəməsinin, adi iş olması məlum olur. Yusifin qardaşları da, Yəqubun yanına qayıdan :zaman dedilər

{يَا أَبَانَا اسْتَغْفِرْ لَنَا ذُنُوبَنَا إِنَّا كُنَّا خَاطِئِينَ}

_Oğlanları ona:)Ata! Bizim üçün günahlarımızın)_“



---

١- [١] . “Nisa”, ۶۴.

(bağışlanmasını dilə, Biz doğurdan da, günahkar olmuşuq_ “.(١_

Bu dilək, həmin şəfaət istəməkdir, yəni sən Allahdan bizim günahlarmızın .bağışlanmasını istə

Səhih Termizidə (sünnilərin mötəbər kitablarından biridir) Ənəs bin Malikdən şəfaət :istəmək barədə açıqca bəyan olunan bir rəvayət nəql olunmuşdur. Ənəs deyir

«سالت النبی | ان یشفع لی یوم القیامه فقال |: انا فاعل. قلت یا رسول الله: فاین اطلبک؟ قال: اطلبی اولا ما تطلبنی علی الصراط. قال قلت فان لم القک علی الصراط؟ قال: فاطلبی عند المیزان. قلت فان لم القک عند المیزان؟ قال: فاطلبنی عندالحوض فانی لا اخطی هذه الموضع»

Peyğəmbər (s) – dən qiyamət günündə mənə şəfaət etməsini istədim. O Həzrət_“ _.buyurdu: Bu işi yerinə yetirərəm

_.Dedim: O gün sizi harada tapım? Buyurdu: siratda_

Dedim: Əgər sizi orada tapmasam? Buyurdu: Mizanın kənarında (sirat kimi, qiyamət_ _(dayanacaqlarından biridir

_:Dedim: Əgər orada da sizi tapmadım, neyləyim? Buyurdu_

(Hovuzun kənarında məni axtar ki, mən bu üç yerdə olacağam_”.(٢_

Nəql olunubdur, Səvad bin Qarib (Peyğəmbərin səhabələrindan biri) Peyğəmbərin mədhində bir neçə şer oxudu və beytlərindən birində bu cür Peyğəmbər (s)-ə xitab :etdi

«فکن لی شفیعا یوم لا ذو شفاعه بمعن فتیلا عن سواد بن قارب»

Ey Allahın Rəsulu! Səvad bin Qaribin fəryadına heç bir şəfaətçinin yetişmədiyi gündə,_“ (mənim şəfaətçim ol_”.(٣

Nəql etdiyimiz iki rəvayətdə, Ənəs bin Malik və Səvad bin Qarib, əziz Peyğəmbər(s) – ?dən nəinki niyə şəfaət istəyirsiz

١- [١] . “٩٧ .”Yusif.

٢- [٢] . əl-camius - səhih, c. ۴, macaə fi şə`nis - sirat babı və kəşful - irtiyab, s ٢٢٥ (bir az fərqlə)

٣- [٣] . “٢٢٥ ,”Kəşful – İrtiyab.

:Niyə müşrik olursuz? Buyurmadı, əksinə buyurdu

Siratda, mizanın və hovuzun yanında özünüzü mənə yetirin ki, sizə şəfaət edəm.“ .Halbuki vəhhabilərin dəlillərinin hamısını burada icra etmək olar

O cümlədən: “lillahiş-şəfaətu cəmia”, ya “fəla təd’u məllahi əhəda”, ya “Bu işin büt pərəstlərin işinə oxşarlığı” və sair. Qeyd olunan arqumentlərə əsasən, Ənəs və .Səvadın işi şirk olacaq

:Əhməd bin Hənbəl, Allah Rəsulnun xidmətçisindən nəql edir ki, dedi

«كـان النبى | ممـا يقول للخادم الك حاجه؟ قال حتى كان ذات يوم. فقا ل يا رسول الله! حاجتى، قال وما حاجتك؟ قال حاجتى ان تشفح لى يوم القيامه، قال ومن ذلك على هذا، قال ربى»

Peyğəmbər (s) həmişə xidmətçiyə deyərdi: Sənin hacətin varmı? Bir gün xidmətçi_“ dedi: Ey Allahın Rəsulu! Bir hacətim var. Peyğəmbər (s) buyurdu: Nə hacətin var? Dedi: Mənim hacətim budur ki, qiyamət günündə mənə şəfaət et. Peyğəmbər (s) buyurdu: (Kim sənə bunu başa salıb, öyrətdi? Dedi: Mənim Allahım_”.(١

**...Peyğəmbər (s) – dən dua və şəfaət istəməyin**

Peyğəmbər (s) – dən dua və şəfaət istəməyin hər bir zamanda mümkün olması

Burada bir şəxsin İbn Teymiyyə və vəhhabiləri müdafiə etmək üçün, “bu iki nəfər Peyğəmbər (s) diri olanda, o Həzrətdən şəfaət istəyiblər, siz isə öləndən sonra və .bərzəx aləmində şəfaət istəməyə etiqadlısız” deməsi mümkündür

Cavab budur ki, onların dəlilləri (şəfaət istəyənlərin müşrik olmasına) diri və ölü vaxtı arasında fərq qoymamışdır. Əgər onlar öz arqumentlərində,” Peyğəmbər dünyadan ”getmişdir və ölülərdən şəfaət istəmək şirkdir



---

.Əhməd bin hənbəlin müsnədi, c. ٣, s ٥٠٠ . [١]-١

desəydilər, ya “ölü peyğəmbər (Allaha sığınırıq) cansız və hərəkətsiz cism kimidir, qətiyyən bizim istəklərimizi anlamır və ondan bir şey istəmək şirkdir” desəydilər, bu zaman diri və ölü arasında fərq qoyardılar və onlardan müdafiə etməyin də yeri var idi. Amma onlar öz istidlallarında, “fəla təd’u məllahi əhəda” ayəsini elə məna ediblər ki, o mənaya əsasən, ümumiyyətlə dua və şəfaət istəmək, istər diridən və istərsə də ölüdən, şirk olacaq. Ona görə də Ənəs və Səvadın şəfaət istəmələri də “fəla təd’u” .ayəsinə şamil olacaq

Digər arqumentlərində deyirdilər:” Şəfaət, Allahdan qeyrisinin qüdrətində olmayan bir işdir və belə bir işi Allahdan qeyrisindən istəmək şirk sayılacaq. Çünki onun mənası .”budur ki, Allahın işini Allahdan qeyrisindən istəyək

Bu arqumentdə də diri və ölü haqqında danışılmayıb. Ümumiyyətlə Allahın işini, Allahdan qeyrisindən istəmək şirk sayılmışdır. Deməli, bu arqumentə əsasən, diri və .ölüdən şəfaət istəmək arasında heç bir fərq yoxdur və hər ikisi şirkdir

İndi soruşuruq ki, əziz Peyğəmbər (s) (Allaha sığınırıq) bunları bilmədiyinə görə Ənəs ya Səvadı şəfaət istəməkdən çəkindirmədi və bunların şirk olmasını buyurmadı? Məhəmməd bin Əbdülvəhhab və İbn Teymiyyə ayələrin mənasını anlayırlar, Peyğəmbər (s) ki, bu şirkdir buyurmayıb, (Allaha pənah aparırıq) anlamamışdı? Bu ayələri Peyğəmbər (s) eşitməmişdimi? Hər halda, bütün arqumentlərdə, diri və ölüdən hacət istəmək arasında bir fərq yoxdur. Bu iki rəvayətdə də, Peyğəmbər (s) nə Ənəs bin Malikə və nə də Səvad bin Qaribə şəfaət istəməyin haram və iradlı olmasına dəlalət edən bir söz

.buyurmadığını görürük

**Daha neçə nümunə**

Hələbinin Sirəsində nəql olmuşdur ki, “Himyər” qəbiləsindən “Təbə” adında bir kişi, Peyğəmbər (s) dünyaya gəlməmişdən qabaq yaşayırdı. O, səmavi kitablarda oxumuş, ya eşitmişdi ki, bir nəfər peyğəmbərliyə seçiləcək. Əlamət və nişanələrdən onun seçilməsinin yaxın olmasını anlamışdı. Digər tərəfdən, o zamana kimi diri qalmayıb və peyğəmbəri görməyəcəyini ehtimal verirdi. Ona görə də Peyğəmbər (s) – in boynunda haqqının olması üçün, məktub, ya vəsiyyətnamə yazdı və Peyğəmbər (s) – dən istədi ki, əgər mən dünyadan getsəm və sizi görməyə müvəffəq olmasam, mənə qiyamət günündə şəfaət et və məni unutma. Bu məktub bir müddət onun qohum və yaxınlarının yanında idi. Peyğəmbər (s) peyğəmbərliyə yetişən vaxt “Təbə” dünyadan getmişdi. Onun qəbiləsi islamı qəbul etdi. Təbənin məktubunu Peyğəmbər (s) – in xidmətinə gətirdilər. Peyğəmbər (s) məktubu oxuyandan sonra, üç dəfə buyurdu: «مرحبا بتبع الاخ الصالح» “_Afərin Təbəyə, layiqli qardaşa_”.(1)

Gördüyünüz kimi, Təbə Peyğəmbər (s)-dən şəfaət istəyib, Peyğəmbər də onu tərifləmişdir. Əgər şəfaət istəmək şirk olsaydı, Peyğəmbər (s) onun barəsində belə sözlər deməməli idi.

Şəfaət istəməyin caizliyinə başqa bir dəlil, səhih Müslimdə gələn rəvayətdir. Diri barəsində olsa da, lakin bizim fikrimizcə diri və ölüdən şəfaət istəməyin arasında



---

۱-[۱]. “Kəşful – irtiyab”, ۲۲۶. Hələbinin sirəsindən nəql olunaraq, c. ۲, s ۸۸.

fərq olmadığına görə, istinad etmək olar. Orada Əbdullah bin Abbas, Peyğəmbər (s)-
:dən nəql etmişdir ki, buyurdu

«ما من رجل مسلم يموت فيقوم على جنازته اربعون رجلا لا يشركون بالله شيئا الا شفعهم الله فيه»

Hər zaman müsəlman bir kişi dünyadan getsə, qırx nəfər Allaha şərik qoşmayan,_“ onun cənazəsinə hazır olsa (və onun barəsində dua edib ya namaz qılsalar) Allah onları (ona şəfaətçi qərar verər_”.(١

Meyyit namazı meyyit üçün dua və iki şəhadətə şamildir. Çünki nə rukusu var və nə səcdələri və nə həmd və surə, əvvəldən axıracan duadır. Hər halda, əgər qırx nəfər namaz qılsa və namazda dua etsələr, həmçinin yalnız onun üçün dua etsələr, bu dua .etmək, həqiqətdə onun üçün şəfaət etməkdir

Allah da onları meyyit üçün şəfaətçi qərar verər. Bu qırx nəfəri şəfaətçi qərar vermək, yəni onların şəfaətlərini qəbul etmək, dua və istəklərini qəbul etmək, həmçinin şəfaət .izni verməkdir

:Digər bir hədisdə Ayişə Peyğəmbər (s) - dən nəql edir

«مامن ميت يصلى عليه امه من المسلمين، يبلغون مائه، كلهم يشفعون له الا شفعوا فيه»

Əgər bir müsəlman ölsə, bir dəstə, yüz nəfərə yaxın adam ona namaz qılsalar və_“ onun üçün rəhmət və bağışlanmaq istəsələr və hamılıqla onu şəfaət etsələr, Allah (onların şəfaətini qəbul edər və onları onun şəfaətçisi qərar verər._”(٢

İndi sual edirik, əgər bir şəxs bu rəvayətləri, yaxud ən azı bu iki rəvayəti eşitsə və ölən vaxt vəsiyyət etsə ki, mən dünyadan gedəndən sonra qırx nəfər, ya yüz nəfər müsəlmanı mənim cənazəmin kənarına gətirin ki, mənim



---

.Səhihi – Müslim”, c. ٣, s ٥٣“ . [١]-١

.”Həmin“ . [٢]-٢

üçün dua etsinlər. Bu şəxs o qırx, ya yüz nəfərdən şəfaət istəməkdən qeyri bir şey istəməmişdirmi? Bu iş şirkdir və iradı vardırmı? Bu şəxs, bu rəvayətlərə əsasən, qırx ya ?yüz nəfərdən dua və şəfaət istəmişdir. Bunun nə iradı ola bilər

:İbn Teymiyyə özü ziyarətul – qübur risaləsində belə nəql etmişdir

Çöldə yaşayan bir şəxs Peyğəmbər (s) – ə dedi: hamımız çətinliyə düşmüşük, arvad – "uşaq acdı və pulumuz da yoxdur. Sən bizim üçün dua et ki, biz Allahı sənin yanında şəfaətçi qərar veririk, səni də Allah yanına şəfaətçi gətiririk. Allah Rəsulu (s) (bu sözdən narahat oldu və) buyurdu: Subhanallah! Vay olsun sənə! Allahı məxluqları yanında (şəfaətçi qərar vermək olmaz. Allahın şən və dərəcəsi bundan daha üstündür". (١)

Burada çöl adamı iki tərəfli şəfaətçi gətirir; Peyğəmbəri Allah yanında və Allahı Peyğəmbər yanında. Peyğəmbər bu sözdən narahat oldu və onu danladı. Bir az diqqət etsək, Allah Rəsulu (s) – in onun əvvəlinci cümləsinə irad və etiraz buyurduğunu anlayacayıq. Çünki şəfaət edən həmişə şəfaət qəbul edəndən daha aşağıdır, nəinki əksinə. Amma ikinci cümləyə, hansı ki, Peyğəmbəri Allah yanında şəfaətçi qərar vermək məsələsinə irad buyurmadı. Həqiqətdə etiraf və təsdiq etdi. Burada İbn :Teymiyyə deyir

Peyğəmbər çöl adamının, biz səni Allah yanında şəfaətçi qərar veririk, cümləsini" təsdiq, Allahı sənin yanında şəfaətçi qərar veririk, cümləsini isə inkar etdi. Çünki şəfaətçi şəfaət qəbul edənin yanında şəfaət edir. Bəndə Allahından (şəfaət) istəməli və onun yanına şəfaətçi



---

.Ziyarətul – qubur risaləsi, s ١٥٥, Kəşful Irtiyabdan nəql ilə, s ٢٢۶ . [١] -١

gətirməlidir. Lakin Allah-taala heç bir bəndədən bir şey istəmir və heç bir kəsin (yanında şəfaət buyurmur”.(١)

Zikr olunan nümunələrlə, heç bir şəkk qalmır ki, Peyğəmbər (s) diri olan zaman bəzi vaxtlar bəzi şəxslər əziz Peyğəmbər (s)-dən dua, ya şəfaət istəyiblər. Şəfaət istəmək də dua istəməyin özüdür. Onlar dua istəməyi caiz bilir, diri olan zaman şəfaət istəmək barəsində isə, sükut ediblər. Bunların bir – biri ilə nə fərqi vardır? Bəli əgər siz istinad və iradı, ölüm məsələsinə diqqət edərək açıqlasaz və diri zamanını, ölüm zamanından ayrı bilsəniz, bəhsə yer var. Amma siz “fəla təd’u məllahi əhəda” və “lillahiş-şəfaətu cəmia” ayəsinə, ya “şəfaət Allahdan qeyrisinin qüdrətində deyil və Allahdan qeyrisindən istənilməməlidir”ə istinad etmisiz. Bu arqumentlərdə diri və ölü arasında heç bir fərq yoxdur, yəni əgər ölümdən sonra şirk və haramdırsa, diri zamanı da şirk .və haramdır



---

.Ziyarətul - qubur risaləsi, s ١٥٥, Kəşful Irtiyabdan nəql ilə, s ٢٢۶ . [١] -١

## ŞƏFAƏT İSTƏMƏK SÜNNİ ALİMLƏRİNİN KƏLAMINDA

### İşarə

Dediyimiz kimi, əgər şəfaət istəmək, diri zamanında düzgündürsə və tövhidlə ziddiyyəti yoxdursa, ölüm zamanı da diri zamanı kimidir və bunların ikisinin arasında .heç bir fərq yoxdur

İndi sünni alimlərindən o cümlədən Malik (Malikiyyə məzhəbinin rəisi) və digər Maliki alimlərindən bəzisi, Hənəfi və Şafeidən neçə rəvayət nəql edirik ki, onların özlərinin Allah Rəsulnun ölümündən sonra, o Həzrətdən dua və şəfaət istəmələrini göstərir və :onun qaydalarını da qeyd etmişlər

Səmhudi vəfaul-vəfada və digərləri hac əməlləri və ziyarət qaydaları kitablarında bu :hədisi gətirib və onun sənədinin doğru olmasını açıqlamışlar

Əyaz şəfada yaxşı sənədlə ibn Həmiddən (o, Malikdən rəvayət edənlərdən sayılır)" nəql edir ki, dedi: Əbu Cəfər (Mənsur Dəvaniqi) Peyğəmbər (s) məscidində Maliklə elmi :mübahisə edirdi. Bu bəhsdə, Malik Mənsura xitab edərək, dedi

Ey Əmirəlmöminin! Səsini bu məsciddə ucaltma, çünki Allah bu ümməti ədəbləndirib (onlara əxlaq və ədəbi öyrədib) və buyurub: “Səsinizi Peyğəmbər (s)-in səsindən uca etməyin.(۱)” Bir dəstəni tərifləyib və buyurub: “Allah Rəsulnun yanında ahəstə danışanlar, o şəxslərdilər ki, Allah onların qəlblərini iman üçün yoxlamışdır”... Bir dəstəni də danlayıb və buyurur: “Otaqların arxasından səni səsləyənlərin çoxu düşünmürlər”. Bilki, Allah Rəsulnun hörməti ölüm halında, onun diri halındakı hörməti (kimidir”.(۲

:Ondan sonra Mənsur xəcalət çəkdi və təvazö halətində dedi

Ey Malik! Peyğəmbərin qəbrinin kənarında dua edərkən, üzü qibləyə dayanmalıyam,“ yoxsa Allah Rəsulu (s) - in qəbrinə üz tutmalıyam? Malik dedi: Üzünü qəbirdən niyə çevirməlisən, bir halda ki, Peyğəmbər qiyamət günündə sənin və atan Adəmin vəsiləsidir. Üzü qibləyə dayan və Peyğəmbər (s) - dən şəfaət istə ki, Allah yanında sənin üçün şəfaət etsin. Allah da buyurmuşdur: Əgər özlərinə zülm edənlər sənin yanına gəlib, Allahın onları bağışlamasını istəsələr və Allah Rəsulu da onlar üçün (istiğfar etsə, həqiqətən Allahı tövbə qəbul edən və mehriban görərlər”(۳). (۴

Bu günlər vəhhabilər, heç kəsi üzü Peyğəmbər (s) - in qəbrinə dayanmağa qoymurlar və camaatı bu işdən çəkindirirlər. Elə bil bu məsələ, o dövrdə də var imiş və



---

.Hucurat”, ۲ və ۳“ . [۱] -۱

.Həmin . [۲] -۲

.Nisa”, ۶۴“ . [۳] -۳

.Vəfaul - vəfa, c ۴, s ۱۳۷۶, Kəşful - Irtiyabdan nəql ilə, s ۲۵۵ . [۴] -۴

ona görə də Mənsur Malikdən bu sualı edib. Malik ki, dörd məzhəbdən birinin rəisidir, açıq və aydın ibarələrlə deyir: "Üzü qəbrə dayan və şəfaət istə". Ayədən başa düşülür ki, insan Peyğəmbər (s) - dən şəfaət, dua və bağışlanmaq istəyə bilər və Peyğəmbər (s) də dua edər və Allah da onun şəfaətini qəbul edər.

Bu hədisi Əlqədir(۱) də nəql etmişdir. Sünnilər müxtəlif kitablarda gətiriblər və hamısı İbn Həmiddən nəql edib və sənədinin doğru olduğunu deyiblər.

Malikin o dövrün xəlifəsi ilə sözləri (onların nəzərilə Əmirəl-möminin) əlbəttə o dövrün cəmiyyətində yayıldı. Çünki bu xüsusi dialoq deyildi, əksinə Allah Rəsulu (s) - in məscidində və cəmiyyət içində baş verdi. Əgər bu iş düzgün olmasaydı və şirk sayılsaydı, hətta əgər şirkə bənzəsəydi və haram olsaydı, Malik heç vaxt belə bir söz deməzdi. O dövrdə baxmayaraq ki, Allah Rəsulu (s) – in səhabələri yox idi, lakin tabein və tabeinlərin tabeini mədinədə var idi. Həmçinin camaatın Allah Rəsulu (s)-nun zamanına yaxın olduğu bir vaxt idi. Bununla belə heç kəs bu məsələni inkar etmədi. Əgər inkar və etiraz olsaydı, nəql olunardı.

#### Əmirəl–möminin (ə) və Əbu–Bəkrin şəfaət istəməsi

Həzrət Əmirəl - möminin Əli (ə) Allah Rəsulu (s) - in qüsl və kəfənin yerinə yetirəndən sonra, o Həzrətə xitab edərək buyurdu:

«بابی انت و امی یا رسول الله! ...اذكر نا عند ربک و اجعلنا من بالک»

"Ey Allahın Rəsulu (s), ata - anam sənə fəda! Bizi rəbbinin yanında yad elə və xatirində saxla_".(۲)

səh:۸۷

---

۱- [۱] . "Əl - qədir", c. ۵, s ۱۳۵.

۲- [۲] . "Nəhcül-bəlağə", sübhi saleh. X ۲۳۵.

Bu xitab, meyyitdən dua istəməkdir. Deməli, Əmirəl - möminin (ə) Peyğəmbər (s) - in .vəfatından sonra, ondan dua istəmişdir

Buna oxşar xülasətul-kəlam kitabında, sünni alimlərindən birinin əsərində, Əbu Bəkrdən nəql etmişdir (Əlbəttə, Peyğəmbər (s) - in pak bədənini, camaatın hamısının ətrafdan gəlib namaz qılmaları üçün, iki, ya üç gün saxladıqlarına görə ikinci hadisə, (.Əmirəl - möminin (ə) hadisəsindən sonra olmuşdur

Səhih sənədlə gəlmişdir: Allah Rəsulu (s) dünyadan köçəndən sonra, Əbu Bəkr yaxına" gəldi və kəfəni o Həzrətin üzündən götürdü və özünü Peyğəmbər (s) - in bədəninə atdı, onu öpdü və dedi: ata - anam sənə fəda! Diri və ölü olanda pak və təmiz idin. Ey (Məhəmməd! Bizi rəbbinin yanında yad et və yadında saxla".(١)

**Dörd məzhəb alimlərinin sözlərinə bir baxış**

.Bu məsələlər barəsində əl-Qədirin beşinci cildində dəyərli məsələlər gəlmişdir

Həmçinin Əllamə Mir Hamid Hüseyn, Əbəqatul-ənvar kitabında. Əllamə Əmini, Allah Rəsulu (s) - in qəbrinin ziyarəti, onun fəziləti və qəbul olması barəsində bəhs edərkən, .təxminən ٢٢ hədis, müxtəlif sənəd və yollarla nəql etmişdir

Bəzi hədislər barəsində, iyirmidən otuza qədər sənəd, o biri üçün ٤١ sənəd(٢) qeyd .ediblər. Bu hədislərin bəzisi keçən bəhslərdə açıqlandı



---

.Xülasətul-kəlam, Kəşful- irtiyabdan nəql ilə, s ٢٢٧" . [١] -١

.əl-Qədir", c. ٥, s ٩٣" . [٢] -٢

Bu hədisləri zikr edəndən sonra, dörd məzhəb alimləri və böyüklərindən təxminən qırx nəfərin sözlərini nəql edir ki, Peyğəmbər (s) – in ziyarətinin qaydaları və onun müstəhəb olması barəsində məsələlər deyiblər.(۱)

O Həzrətin (s) qəbrini ziyarət etməyi bidət bilmək, vəhhabilərin bidət qoyduqları məsələlərdən olması və dörd məzhəb alimlərinin onlarla bir əqidədə olmaması məlum olur. Əllamə Əmini (q. s) sünni alimlərinin sözlərini nəql edərkən, Maliki məzhəb alimlərindən biri olan "İmamul-qüdvə" adlı bir şəxsin sözünü gətirib və deyir:

İmamul-Qüdvə "əl-Mədxəldə" qəbirlərin ziyarəti fəslində deyir: "Hər vaxt ziyarətçi peyğəmbərlərin və Allahın böyük elçilərinin ziyarət qəsdini etsə, onların yanına yetişdikdə, təvazö, sınıqlıq, ehtiyac, fəqr, yoxsulluq, ehtiyac, çarəsizlik və aşağılıq halətində olmalıdır.

Hüzuri qəlb və diqqətlə, onları başın gözü ilə yox, əksinə qəlbin gözü ilə görməlidir. Çünki onların bədəni köhnəlmir və dəyişilmir. Sonra Allaha layiq onu tərif etsin. Bu zaman onlara salavat göndərsin və onların vasitəsi ilə Allaha təvəssül etsin, ya hacəti yerinə yetirilsin və günahları bağışlasın, onlara yalvarsın və hacətlərini onlardan istəsin..., Çünki onlar İlahi dərgaha daxil olmaq üçün həmişə açıq qapılardır. İlahi sünnət belə icra olur ki, hacətlər onların əli ilə yerinə yetirilsin... Kim peyğəmbərlərin qəbirlərini ziyarət edə bilmirsə, uzaqdan onlara salam desin, hacət və günahların bağışlanmasından və s... nəyə ehtiyacı varsa, dilinə gətirsin və istəsin".(۲)



---

۱- [۱]. "Həmin", s ۱۰۹.

۲- [۲]. Həmin, s ۱۱۱, Əlmədxəldən nəql ilə, c. ۱, s ۲۵۷.

Bu məsələləri bütün peyğəmbərlər (ə) – ın ziyarəti barəsində zikd edir, sonra Həzrət Rəsul (s) – in ziyarəti barəsində geniş və maraqlı şeylər açıqlayır, lakin onun qeyd etdikləri çox olduğuna görə qısa olmağı nəzərdə tutaraq, onlardan bir hissəsini nəql :edirik

İlk və son seyid və başçı (Allahın salavat və salamı ona olsun) – nın ziyarəti barəsində.“ Hər kəs ona təvəssül edə, kömək istəyə və öz hacətlərini ondan istəsə, istəyi rədd olmaz və cavabsız qalmaz. O Həzrətin ziyarətçisi, elə hiss etməlidir ki, o diridir, necə ki, diri olanda belə idi, O Həzrətlə üz – üzə dayanmışdır, çünki onun diriliyi və ölümü arasında heç bir fərq yoxdur, yəni o, öz ümmətini görür və onların fikir, qərar, niyyət və hallarından xəbərdardır. Onların hamısı o Həzrət üçün aydındır... Deməli, o Həzrətə təvəssül etmək, xəta və günahların ağır yüklərinin tökülməsinə səbəbdir, çünki günahlar onun şəfaətinin böyüklüyü və bərəkəti müqabilində, çox kiçikdir. Onun şəfaəti günahların hamısından daha böyükdür. Buna əsasən, O Həzrəti ziyarət edən hər bir kəsə müjdə olsun. O Həzrətin ziyarətinə gedə bilməyən şəxs, Həzrətin İlahi dərgahındakı şəfaətinə pənah gətirib, desin: İlahi! Səni Həzrət Rəsul (s) –in yanındakı hörmətinə and veririk, bizi onun şəfaətindən məhrum etmə. Hər kəs dediyimizdən başqa şeyə etiqadlı olarsa, məhrumdur. Belə bir şəxs Allah – Taalanın buyurduğunu eşitməmişdirmi? Əgər özlərinə zülm edənlər sənin yanına gəlib, Allahdan bağışlanmaq istəsələr və sən də onlar üçün istiğfar etsən, əlbəttə Allahı tövbə qəbul edən və mehriban görərlər. Deməli, hər kəs onun yanına gəlib, dərgahında dayana və təvəssül edə, Allahı tövbə qəbul edən və mehriban görəcək, çünki Allah vədəyə xilaf çıxmaqdan

münəzzəhdir. Peyğəmbəri şəfaətçi qərar verən şəxsə, tövbəni qəbul etmə vədəsini verib və bu elə bir məsələdir ki, heç kəsin onda şəkk və şübhəsi yoxdur, yalnız dini inkar edib, Allah və onun Rəsulnun müxalifi olan şəxslərdən başqa. Biz bəhrəsizlik və (məhrumiyyətdən Allaha pənah aparırıq”.(١

## Həzrət Rəsul (s) – un ziyarət və dualarında araşdırma

Əllamə Əmini, Həzrət Rəsul (s) - in ziyarətinin əhəmiyyəti barəsində, digər alimlərdən bir neçə ibarə gətirir. O cümlədən: Əbu Mənsur Kermani hənəfi, Qəzzali Ehyaul-ulumda, Faxuri Kifayədə, Şərnəblali Məraqil-fəllahda, Səbki, Səmhudi, Qəstəlani (Səhih buxariyə şərh verənlərdəndir), Həmzavi, Ədəvi və onlardan başqaları da, (hamısı qırx kəlam və ibarələrdir.(٢

Sonra nəql etdikləri dua və ziyarətləri misal gətirir. Misal üçün, ziyarət üçün naib olan :və başqa bir şəxs tərəfindən Həzrəti ziyarət edən şəxs barəsində deyiblər

«ان النائب يقول:السلام علیک یا رسول الله! من فلان بن فلان یستسفع بک الی ربک بالرحمه و المغفره، فاشفع له»

Naib ərz edir: Ey Allah Rəsulu! Filankəsin oğlu filankəs tərəfindən sənə salam_“ deyirəm. O səndən istəyir ki, Allahının yanında bağışlanmaq və rəhmət ilə onun üçün (şəfaət edəsən, onda sən də onun şəfaətçisi ol_”.(٣

Sonra O Həzrətin (s) ziyarəti üçün sünnət və müstəhəb olan əməlləri, onların sözlərinin ,içindən nəql edir, təkrar yerləri həzf etməklə, ٢٥ əməldən çox, qüsl, ədəb riayəti



---

.Əl Qədir”, c. ۵, s ١١٢“ . [١] -١

.Həmin”,١٠٩-١٢۵“ . [٢] -٢

.Həmin, s ١٢٨ . [٣] -٣

ziyarət forması və s... qəbilindən olur.(۱) Sonra ziyarət babına varid olur və təxminən doqquz növ ziyarəti, sünni alimlərindən nəql edir. Biz şiələrin dua və ziyarət kitablarında bir neçə ziyarətdən başqa ziyarətimiz yoxdur, amma onların doqquz :ziyarəti vardır ki, orada şəfaət istəmək məsələsi çox gözə çarpır

Əssəlamu ələykə ya səyyidi ! Ya Rəsuləllah ! Əssəlamu ələykəYa nəbiyyəllah ! Əssəlamu ələykə Ya həbibəllah ! Əssəlamu ələykə Ya nəbiyyər- rəhmə ! Əssəlamu ələykə Ya şəfiəl-ümmə!... Ya Rəsuləllah! nəhnu vifdukə və zuvvaru hərəmik. Təşərrəfna bil-hululi bəynə yədəykə və ci'na... bi-qəsdi ziyarətikə li-nufuzi bi-şəfaətik... fə-innəl-xətaya qəd-qəsəmət zuhurəna vəl-əvzaru qədisqələt kəvahiləna; və əntə əş-şafiul-muşəffəul məv'ud biş-şəfaətil-uzma vəl-məqamil-məhmudi vəl-vəsilə,və qəd qaləl-lahu təala: vələv ənnəhum iz-zələmu ənfusəhum və qəd ci'nakə zaliminə li-ənfusina, mustəğfirinə li-zunubina, fəşfə ləna ila rəbbikə vəs'əlhu ən yumitəna əla sünnətikə və ən yəhşurəna fi zumrətik və ən yurədəna hovzək və ən (yəsqiyəna bi-kəsik... Əş-şəfaə əş-şəfaə ya Rəsuləl-lah !(Üç dəfə deyirsən).(۲)

.Səkkizinci ziyarətdə də həmin ibarələrə oxşarlıq vardır

Ümumiyyətlə, bu ziyarətlərin hamısında təvəssül, dua, şəfaət istəmək və "və ləv .ənnəhum iz- zələmu" ayəsini oxumaq var

Əllamə Əmini bu ziyarətlərdən sonra, O Həzrəti (s) ziyarət edən vaxt oxunan duaları, -"Əd- dua ində rə`sin



---

.Həmin, s ۱۳۰ – ۱۳۵ . [۱]-۱

.Həmin",۱۳۸-۱۳۹" . [۲]-۲

nəbi (s)” adı altında və ondan başqa adlarda gətirmişdir. Sonra bir neçə alimdən nəql edir ki, deyiblər: Peyğəmbər (s) – in qəbrinin kənarında oxunan ən yaxşı ibarədən biri budur ki, o Həzrətin yanında tövbəni təzələyib və “... və ləv ənnəhum iz zələmu :ənfusəhum”.(١) ayəsini tilavət edəndən sonra deyəsən

Nəhnu vifdukə ya Rəsuləllah! Və zuvvarukə, ci`nakə liqəzai həqqikə və li təbərruki“ biziyarətikə vəl istişfai bikə mimma əsqələ zuhurəna və əzləmə qulubəna (... fəstəğfir (ləna vəş fə`na ila rəbbikə ya şəfiəl muznibin)”.(٢)

Əllamə Əmini bu ibarələri nəql edəndən sonra, Peyğəmbər (s) – ın qəbrinin kənarında ondan şəfaət istəmək, yalvarmaq və təvəssül etməyi təkid edib. Əməl qaydaları verən, sünni alimlərindən bir neçəsindən iyirmi sözə yaxın, nəql edir. Onlardan biri :Qəstəlani, Buxariyə şərh verənlərdəndir(٣) ki, əl-Məvahibud-diniyyə də deyir

O Həzrətin ziyarətçisinə layiqdir ki, çoxlu dua və zarlıq etsin. Ona təvəssül etsin.“ Ondan istiğasə və şəfaət istəsin. İstənilən vaxt hər bir adam peyğəmbərlərdən şəfaət .”istəsə, Allahın peyğəmbərinin onun üçün şəfaət verməyə ləyaqəti vardır

:Bundan sonra, bu sözlərin hamısını mənalandırıb, deyir

İstiğasə, hacət istəmək və pənah (pənah istəmək) mənasındadır. Deməli, pənah“ istəyən, pənah istəniləndən, pənah vermək istəyir ki onun üçün sığınacaq hazırlasın. İstiğasə kəlməsi, ya təvəssül kəlməsi, ya şəfaət kəlməsi və



---

١- [١] . “Nisa”, ۶۴.
٢- [٢] . “Əl Qədir”, c. ۵, s ١۴١.
٣- [٣] . Həmin, s ١۴۴.

yaxud təvəccoh və təcəvvuh (hər ikisi dərəcə və məqamın ucalması mənasındadır) .”kəlmələrilə deməsi arasında heç bir fərq yoxdur

Şəfaət, dua istəmək və təvəssül etməyin şirk və haram olmasına, saleh sələfinin icma etməsinə aid vəhhabilərin iddiası, səhv və dəlilsiz bir iddiadır. Bunların saleh sələflərinin kimliyi məlum deyil. Çünki sünni alimləri (hansı ki, onların neçəsindən bir neçə ibarə nəql etdik) dörd məzhəbin böyüklərindəndirlər, onların hamısı Peyğəmbər üçün ziyarət, dua və təvəssül nəql ediblər, xüsusilə şəfaət istəməyi dəfələrlə öz .kitablarında zikr ediblər

Bütün bu sənədlərlə, vəhhabilərin iddia etdikləri məsələlərin yeni olmadığı, əksinə İbn Teymiyyənin zamanından və sonralar Məhəmməd bin Əbdül-vəhhab tərəfindən açıqlanması məlum olur. Əgər bu dəstə olmasaydı, indi həm şiələr və həm də digər müsəlmanlar, rahatlıqla bu əməlləri yerinə yetirərdilər. Çünki bu məsələlər tək şiələrə .məxsus deyil

Dediklərimiz şəfaət istəmək barəsində idi, indi isə, şəfaət bəhsinin əsasına keçirik. Bu :barədə şübhə və suallar var. O cümlədən

?Şəfaət necədir -

?Günahların hamısı şəfaət oluna bilər, yoxsa bəzi günahlar -

?Şəfaətin şərtləri nədir -

?Şəfaət edən kimdir -

?...Kimlər şəfaət olunarlar və s -

Bu məsələlər haqqında da bəhs etmək lazımdır, çünki biz də belə ifrat və təfritlərlə qarşılaşırıq. Bəzi şəxslər elə

bilirlər ki, əgər namaz qılmasalar, oruc tutmasalar və vəzifələrini yerinə yetirməsələr də, qiyamət günü İmam Hüseyn (ə) hökmən onlara şəfaət edəcək və özlərini indidən .behişt əhli bilirlər

## ŞƏFAƏTİN ƏSASINA AİD OLAN İRADLARA CAVAB

### İşarə

:Şəfaətin əsası barəsində açıqlanan iradlar bunlardır

Birinci irad: Şəfaətə etiqadlı olmaq, camaatın günah etməyə cürət etmələrinə və onların günaha həvəslənməsinə səbəb olur. Əgər insanın etiqadı bu olsa ki, hansı günahı etsə də, qiyamət günü şəfaət olunacaq, onda təbiidir ki, onun əli günah etməyə adət edəcək. Şəfaətə ümidvar olmaq, camaatı elə tərbiyə edir ki, islamın göstəriş, hökm və qanunlarına etinasız olsunlar. Namaz, oruc və vacibləri tərk edib, günah .etsələr də, sonda şəfaət oluna bilmələrini təsəvvür edirlər

İkinci irad: Şəfaətə inam, Allahın şəfaətçinin iradə və istəyinin təsiri altına düşməsini deməyimizi lazım tutur. Beləki, Allahın iradəsi günahkarları cəhənnəm odunda əzablandırmaqdır, lakin şəfaət edən Allaha təsir edir və onun iradəsini dəyişir. Halbuki biz heç bir varlığın Allaha təsir etmədiyinə və təsirlənməyin Allahda baş vermədiyinə .inanırıq

Üçüncü irad: Şəfaət bir növ tərəf saxlama və istisnadır. Allahın halal-haram, hökm və qanunları var. Vacib və haramlar müəyyənləşdirib və onları insanların hamısına çatdırmışdır. Bir dəstə öz vəzifələrinə əməl edirlər və başqa bir dəstə əməl etmirlər. Əməl etməyənlər günahkar olurlar. Günahkarlar üçün əzab və cəzalar müəyyənləşdirib. Buna əsasən, günahkarların hamısı cəzalanmalıdır. Əgər Allah onlardan bəzisini cəzalandırmayıb və günahlarından keçsə, bu bir növ ədalətsizlik, .yersiz üstünlük və istisnadır, hansi ki, Allahdan uzaqdır

Dördüncü irad: Məsələ iki haldan xaric deyil: Ya günahkarı cəzalandırmaq, ədalətə uyğundur və ya zülmə uyğundur. Əgər günahkarı cəzalandırmaq və əzab vermək zülmdürsə, onda cəza qanunu yersizdir və qoyulmamalı idı. Yox, əgər cəza və əzab ədalətdirsə, onda cəzanı icra etməmək və günahkarın günahından keçmək zülm olacaq. Buna əsasən bunların ikisindən biri, zülmdür və hər ikisi də uca Allahın .şənindən uzaqdır

.Şəfaət bəhsində digər məsələlər də deyilib, lakin ən əsas iradlar açıqlananlar idi

### Şəfaət başər cəmiyyətlərində

İnsanlar arasında şəfaət belədir ki, kimsə bir gunah etsə, cərimə və cəzadan qaçmaq üçün, məhkəmə və hakim dairəsində nüfuz və qüdrəti olan bir şəxsə yanaşır və vasitəçilik istəyir. Həmin nüfuzlu şəxs də günahkara cəzanın icra olmaması üçün vasitə .olur

Bəzən vasitə olan şəxsin qüdrəti, hökumətin gücündən çox olur. Hakim şəxs onun nüfuz və qüdrətindən çəkinir

və onunla müxalifətçilik etmək nəticəsində, hökumətinin vəziyyətinin qarışmasından .qorxur

Bəzi vaxtlarda da vasitə və şəfaət edən, hakimin, ya qüdrət sahibinin şəfqət və məhəbbətini bir yolla təsiri altına salır. Məsələn, günahkarın yaşayışı, vəziyyəti və onun çarəsizliyindən danışır, onu şəfqət və mərhəmətə gətirir. Bəzən də şəfaətçi qüdrət sahibi ilə dostdur və bu iki nəfər necə deyərlər, bir – birlərini nəzərə alırlar, bir – birinə çörək verib və bir – birləri üçün iş görürlər. Hər halda, bu səbəblərdən biri ilə şəfaətçi və vasitə, bəşər şəfaətlərində, qüdrət sahibini təsiri altına salır və ona nüfuz .edib, iradə və qərarını dəyişir

Belə yerlərdə şəfaətçi, dostu barəsində qanunun icra olunmasının qarşısını almağa .çalışır

Dediyimiz iradların bəzisi, bu təsəvvürlə açıqlanıb ki, şəfaət qiyamət günü də belədir. .Əlbəttə, bu cür şəfaətə də irad var, çünki bu həqiqətdə qanunu sındırmaqdır

Misal üçün, zina edib və günahı da tam sabit olan şəxs üçün, digər bir şəxs, günahkara hökm və cəzanın icra olunmaması üçün, hakimin yanında vasitə olsa, bu əlbəttə ki, .tərəf saxlamaqdır

Həmçinin, bu sual və iradın yeri var ki, deyək: Bu günah və pis iş üçün qoyulan cəza iki haldan xaric deyil: ya ədalətdir, ya da zülm. Əgər ədalətdirsə, onu yerinə yetirməmək .zülmdür və əgər zülmdürsə, qoyulmamalı idı. Belə bir cəzanın qoyulması özü zülmdür

Günaha həvəsləndirmə məsələsi də belədir. Əgər partiyabazlıq yayılsa və hər kəs hər bir işi görsə, onun üçün şəfaət edib və günahından keçmələri üçün vasitə

gətirsə, belə bir cəmiyyətdə qanun sındırmaq və cinayət etmək üçün camaatın əli açıq .olur

Həmçinin, əgər bir cəmiyyətdə pul hər bir işi görsə və cinayətkar şəxslər pul verməklə, öz işlərini necə istəsələr yerinə yetirsələr, camaat cinayət edəndə, öz qarşılarında mühüm bir mane görməyəcəklər və cinayət, pis iş, qanun sındırma və qanun .cəzasından qaçmaq, yayılacaq

Batil vasitələr, şəfaətlərdə olan fəsadlar və həmçinin Qiyamət günündə salehlərin, övliyaların, peyğəmbərlərin və İlahi şəfaətçilərinin şəfaətini, Allahın müqəddəs yanında, nüfuzlu və qüdrətli insanların, bəşərin qüdrət sahiblərinin və hakim dairələrinin yanında etdikləri şəfaət kimi təsəvvür etmələri, şəfaət məsələsinə belə bir iradların olmasına səbəb olmuşdur. Bu islam məsələlərinin çoxunun həqiqət və mahiyyətinin, camaat üçün aydın olmamasını göstərir. Bir halda ki, şəfaət qəti və hamının qəbul etdiyi əsaslardandır, hansı ki, Quranın onun barəsində açıq ayələri var. Müsəlmanların da ona icması var, ona görə də şəfaətin həqiqəti ətrafında bəhs etmək və bu məsələnin müxtəlif tərəflərinin aydın olması üçün, ayə və rəvayətlərə müraciət .etmək lazımdır

**Şəfaət lüğətdə**

:Rağib İsfahani yazır

Şəf" sözü, bir şeyin özü kimisinə yapışmasından ibarətdir... və şəfaət də başqasına" “ (şəfaətçiyə) yapışmaqdır. Belə ki, şəfaət edən ona kömək etsin və o da şəfaət edəndən istəsin. Çox vaxt şəfaət o yerdə işlənir ki, yuxarı məqamın hörməti, aşağıdakı şəxsə

(əlavə olsun. Şəfaət qiyamətdə bucürdür”.(١)

Şəfaətin lüğəti mənası, istənilən nəticə və təsiri verməsi üçün, biri o birisini təkmilləşdirməkdən ötəri, iki şeyi bir - birinə əlavə etməkdən ibarətdir. İstər o iki dənə eyni dərəcədə olsun və ya biri daha yuxarı dərəcədə və daha güclü olsun. Lakin çox vaxt o yerdə işlənir ki, güclü şəxs zəif şəxsə və üstün aşağıya əlavə olub və təsir .mənşəyi olsun

Şəfaətin terminoloji mənası və bütün camaat içində şəfaət adlanan şey odur ki, qanunu pozan, cinayətə məhkum olan və cəzalanması lazım olan bir şəxs, onu cəza və işkəncədən xilas etməsi və onun barəsində vasitə və şəfaətçi olması üçün, bir şəxsi vasitə qərar verir və ya maddi mənfəət və üstünlüklərə yetişmək üçün, bir şəxsdən .istifadə edib, onun vasitəçiliyi ilə öz məqsədinə yetişir

## Şəfaətin qisimləri

### İşarə

Şəfaətin lüğəti mənasına diqqət edərək, onun üçün qisimlər saymaq olar. Baxmayaraq : ki, onlardan bəzisi terminoloji şəfaət deyildir

### Xilqətdə şəfaət .١

Təkvin və yaranış aləmində şəfaət bu mənadadır ki, bu dünyanın güclü qüvvələri, zəif qüvvələrinə əlavə olur, onları yaranış hədəfləri və təkamül yolunda irəliyə aparırlar. Günəş saçır, yağış yağır və toxumları yerin dibində, onların daxili istedadlarının feliyyətə yetişməsi



---

.Müfrədat”, s ٢۶٣“ . [١] -١

və həyat gövdələrinin torpağın altından və dənələrdən cücərməsi üçün hazırlayır. Bunun özü bir növ şəfaətdir. Çünki bir güc başqa bir gücə əlavə olur ki, zəif gücün .təkamülü üçün yol açılsın

Digər tərəfdən, yaranış səbəblərinin hamısı Allah-Taalanın zatı ilə bitir. Onların hamısı, Allahın saysız nemətlərinin və sonsuz rəhmətinin yayılması üçün, Allah ilə yaranış və varlıq aləmi arasında vasitələrdir. Bu açıqlamaya əsasən, təbiətin bütün səbəbləri, Allah feyzinin məcrasıdır. Hər bir səbəb, öz nəticəsinə feyz yetirmək vasitəsidir. Deməli, hər bir səbəb, İlahi rəhmətin yayılması və yaranış nemətinin yetişməsində .şəfaətçi bir vasitədir

Yaranış səbəbləri, Allah - Taalanın zatının məxluqudurlar. Özlərindən heç bir vücud müstəqilliyi yoxdur. Onların vücudu ondandır. Allahın uca sifətlərindən kömək istəyirlər. Əslində vücud feyzi və rəhmət yayımının mənşəyi Allahın uca sifətləri, o cümlədən Allahın həyat, xaliqlik, raziqlik və rəhmaniyyətidir ki, həyat, ruzi, yaranış və .bunlardan başqalarının mənşəyidir

Başqa ibarə ilə, İlahi feyzlər uca sifətlərdən süzülür və səbəb məcrasından bu .feyzlərin qabiliyyəti olan yerlərə nemət və rəhmətləri yetirir

Buna əsasən, nemət və rəhmətin genişlənməsi, yayılmasında və vücud feyzinin yetişməsində həqiqi şəfaətçi, Allah Taalanın zatıdır və mütləq şəfaətçi Odur. Səbəbləri yaradıb və onları geniş rəhmətinin və vücud feyzinin yetişməsində vasitə qərar verən .Allahdır

Buna əsasən, əgər Allahdan başqa bir mövcud, şəfaətçi

olub və şəfaət etsə, istər yaranış mərhələsində və istərsə də axirət bağışlanması və .məğfirəti məqamında, hamısı onun izni ilə və onun tərəfindən seçilməklədir

:Səhifeyi-Səccadiyyədə belə oxuyururq

«اللهم صل على محمد وآله وشفع فی خطایای کرمک... ولا شفیع لی الیک فلیشفع لی فضلک»

İlahi! Məhəmməd və ali Məhəmmədə salam göndər və mənim səhvlərimdə öz_“ kərəmini şəfaətçi qərar ver, İlahi! Mənim sənin yanında heç bir şəfaətçim yoxdur, (onda sənin fəzlin mənim üçün şəfaət etsin_”.(١

## Əməldə şəfaət, yaxud şəriətdə şəfaət .٢

Hər bir cəmiyyətdə və hər bəndə və ağa arasında, iki cür qanun var: Biri, cəmiyyətin onlara əməl etmək vəzifəsi olan və onlar qarşısında məsul olan, qanun və qaydalar. O biri, o qanunlara riayət edib, ya riayət etməyənlər üçün qoyulan mükafat və cəzalar. Ona görə də hər bir qanun kənarında, o qanunu pozmanın cəriməsi və bəzən də ona .əməl edənlər üçün, həvəsləndirmə mükafatları da qoyulur

Əlbəttə, bəşər qanunlarında, bəzi nadir halları istisna edərək, mükafat olmur, lakin İlahi qanunlarda, həm savab - mükafat və həm əzab - cəza vədəsi, bir-birinin .kənarında açıqlanıb

Allah insanların xoşbəxtlik və təkamülü üçün, iki şey qərar vermişdir: Biri qanun və .hökmün əsası, o biri isə qanunu pozarkən cəza və ya ona əməl edərkən mükafat

Xoşbəxtliyə və insan təkamülünə yetişmək üçün və başqa sözlə, axirət savablarından faydalanmaq və İlahi



---

.Səhifeyi Səccadiyyə, dua ٣١, fəraz ٢٥ – ٢٦“ .[١]-١

cəzalardan xilas olmaq üçün, doğru və ağıl qəbul edən yol odur ki, İlahi əmrlərə əməl olunsun. Səmavi qanunları və hökmləri çatdırmaq vasitəsi olan İlahi rəhbərlərdən və peyğəmbərlərə itaət olunsun. İlahi rəhbərlərə itaət edib, Allahın qanun və əmirlərinə əməl edən şəxslər, əlbəttə, savab – mükafat və maddi – mənəvi təkamülə yetişib, .qanun və hökmləri pozmanın əzab və cəzalarından amanda qalacaqlar

Digər mühüm məsələ budur ki, əməllərin nəticəsi və mükafatlar, axirət dünyasına məxsus deyil, əksinə İlahi göstərişlər və əməllərin bəzisi, öz yaxşı, ya pis nəticələrini bu dünyada da göstərəcəklər. Yəni axirət dünyasında itaət və günahın, mükafat və .cəzasından əlavə, bu dünyada da yaxşı və pis nəticələri olacaq

İlahi rəhbərlərdən itaət, səmavi göstərişlər və vəzifələrə əməl etmək də bir növ şəfaətdir. Hansıki insanla yanaşı olduqda, insanın təkamülünə və xoşbəxtliyə yetişməsinə səbəb olub, insanı cəzalardan qoruyur və İlahi razılığa yetişməyə və .mükafatlanmalarla sona yetir

Şəfaətin bu qismini, təşrii şəfaət də adlandırmaq olar. Çünki, təşri və qanun qoymaq, insanın dünyəvi və axirət təkamülünə və xoşbəxtliyinə yetişməsində vasitə və .şəfaətçidir

Həmçinin onu əməlin şəfaəti adlandırmaq olar, çünki əməl insana şəfaətçidir və .onunla olub, onu əzab və cəzadan qurtarıb və əməlin mükafat və savabına yetirir

Rəvayətlərdə də, bəzən şəfi (şəfaətçi) kəlməsi, Allahın itaətinə deyilib; necə ki, Əmirəl möminin (ə) – ın Nəhcül – bəlağəsində oxuyuruq:- «فاجعلوا اطاعه الله... شفيعا» “_Allahın itaətini_

(şəfaətçi qərar verin_".(١_

Buna əsaən, Allahın itaəti, özü şəfaətçidir və insan Allaha itaət etmək vasitəsilə, ona .layiq olan təkamül və xoşbəxtliklərə yetişəcək

Şəfaətçi kəlməsi, Qurani-kərim barəsində də işlənib. Quranın şəfaəti bu cürdür: Bir cəmiyyət və ya bir şəxs Qurana əməl edərsə, Qiyamət günündə Quran onun üçün .şəfaətçi və vasitə olar

:Bu məsələ rəvayətlərdə müxtəlif ibarələrlə bəyan olmuşdur, o cümlədən

«الشفعاء خمسه: القرآن والراحم والامانه و نبیکم و اهل نبیکم»

Şəfaət edənlər beş dənədir: Quran, qohumlar, əmanətdarlıq, sizin peyğəmbəriniz və_" (sizin peyğəmbərin əhli __-__ beyti_".(٢

### Rəhbərin şəfaəti .٣

İnsanın bu dünyada yerinə yetirdiyi əməl və rəftarların hamısı, o biri dünyada təcəssüm edəcək, öz həqiqi formalarında görünəcəklər. Nəinki yalnız əməllər, hətta dünyada insanlar arasında olan maddi və mənəvi əlaqələr də, o dünyada xarici və zahiri formalar tapacaq. Əgər bir şəxs bu dünyada, başqasının hidayətinə səbəb olsa, rəhbərlik və ardıcıllıq əlaqəsi onların ikisi arasında qiyamətdə xarici formasına düşəcək. Bu dünyada imam və hidayətçi olan şəxs, o dünyada da, imam və rəhbər formasında, hidayət olan şəxs isə, itaət edən və hidayət edənin ardıcılı formasında zahir olacaqlar. Haqq rəhbərlər öz ardıcıllarını qiyamətdə əbədi xoşbəxtliyə yetirəcək, onların təkamül və İlahi nemətlərə yetişmələri



---

.Nəhcül - bəlağə", Sübhi saleh, x ١٩٨" . [١] -١

.Bəharül - ənvar", c. ٨, s ۴٣" . [٢] -٢

üçün vasitə və şəfaətçi olacaqlar. Başqalarının zəlalət və azğınlığına səbəb olan batil rəhbərlər də , O gün öz ardıcıllarını əməllərinin əzab və cəzasına tərəf rəhbərlik edəcəklər. Əslində onların İlahi əzablara yetişmələrində vasitə və şəfaətçi olacaqlar.

.Bunu nəzərə alaraq, şəfaətin qisimlərindən birini, rəhbərin şəfaəti bilmək lazımdır

:Allah Quranda buyurur

{يوم ندعوا كل اناس باما مهم...}

Bir gün (qiyamət günü) bütün insanları öz imamları (ardınca getdikləri rəhbərləri,_“ (yaxud peyğəmbəri və ya əməl dəftərləri) ilə birlikdə (hüzurumuza) çağıracağıq_”.(١)

{يقدم قومه يوم القيامه فاور دهم النار...}

Firon) qiyamət günü camaatının qabağında gedib, onları atəşə (Cəhənnəmə))_“ (aparacaq_”.(٢)

Buna əsasən, həm həqiqi və əsl rəhbərlər, axirət dünyasında öz ardıcıllarının vasitə və şəfaətçiləridilər,onları cənnətə və İlahi nemətlərə tərəf göndərərlər və həm də zəlalət və azğınlıq rəhbərləri (fironlar), öz ardıcıllarını cəhənnəmə yetirməkdə, onların .şəfaətçisi olarlar

Bunların hər ikisi, bu dünyada itaət və rəhbərliyin təcəssümüdür. Əlbəttə, bu dünyada insan üçün hər bir rəhbərə itaət etmək, ixtiyaridir. O biri dünyada isə, qeyri ixtiyari olacaq, yəni ki, insan qiyamət günündə dünyada ardınca getdiyi imamın itaətindən boyun qaçırıb və onun ardıyca getməyə bilməz. Çünki o gün olunan tabeçilik və .ardıcıllıq, bu dünyadakı hərəkət və ardıcıllığın xarici təcəssümüdür



---

١- [١] . “İsra”, ٧١.

٢- [٢] . “Hud”, ٩٨.

Rəvayətlərdə belə bir şəfaətə də işarə olunub. Bir neçə nümunəni diqqətinizə :çatdırırıq

:A – İslamın əziz Peyğəmbəri (s) – dən nəql olub

«فـاذا التبست عليكم الفتن كقطع الليـل المظلم فعليكم بـالقرآن فانه شافع مشـفع وماحل مصـدق ومن جعله امامه، قاده الى الجنه ومن جعله خلفه، ساقه الى النار و هو الدليل يدل على خير سبيل و هو كتاب فيه تفصيل و بيان»

Nə vaxt fitnələr qaranlıq gecə kimi sizi tutsa, Qurana pənah aparın, Çünki Quran,_“ şəfaəti qəbul olunan bir şəfaətçidir və vasitəçiliyi təsdiq olunan bir vasitəçidir. Kim Quranı özünə rəhbər və hakim tutsa, onu behiştə aparar. Km ki_,_ Qurana arxa çevirsə, onu cəhənnəmə aparar. O, ən yaxşı yollara hidayət edən bir hidayətçi və elə bir kitabdır ki, onda xoşbəxtlik və bədbəxtlik yolları və vəzifələr geniş şəkildə bəyan (olmuşdur_”.(١)

Bu hədisə işarə etməkdə məqsədimiz əsasən, “və mən cə`ələhu əmaməhu, qadəhu iləl cənnəti və mən cə`ələhu xəlfəhu, saqəhu elənnar” cümləsidir. Çünki, bu dünyada Quranı özünə rəhbər və imam qərar verən şəxsin, o dünyada Quran onun behiştə tərəf aparan rəhbər və imamıdır. Bu dünyada Qurana arxa çevirən şəxsi, orada da Quran onu cəhənnəmə tərəf aparacaq. Bu, dünyada rəhbərə itaətin təcəssümüdür ki, .şəfaətin örnəklərindən sayılır

.B. İmam Sadiq (ə) aşağıdakı ayənin izahında buyurublar

{وَأَنذِرْ بِهِ الَّذِينَ يَخَافُونَ أَن يُحْشَرُواْ إِلَى رَبِّهِمْ لَيْسَ لَهُم مِّن دُونِهِ وَلِيٌّ وَلاَ شَفِيعٌ لَّعَلَّهُمْ يَتَّقُونَ}

Rəbbinin hüzuruna cəm ediləcəklərindən qorxanları onunla (Quranla) xəbərdar et._“ Onların Allahdan başqa heç bir hamisi və havadarı yoxdur. Bəlkə də, onlar (bununla) _pis əməllərdən



---

.Usuli- kafi (mütərcim) , c ۴, s ٣٩٨ – ٣٩٩, fəzlul – quran kitabı, h ٢ . [١]-١

(qorxub çəkinələr!_”.(١_

:Buyurur

«وانذر بالقرآن من يرجون الوصول الى ربهم ترغبهم فيما عنده فان القرآن شافع مشفع لهم»

Quran vasitəsilə, Allaha yetişmək ümidi olan şəxsləri qorxut və Allah yanında_“ (olanlarla həvəsləndir. Çünki Quran şəfaəti qəbul olan şəfaətçidir_”.(٢

:C. İslamın əziz Peyğəmbəri (s) - dən nəql olunmuşdur

«تعلموا القرآن فانه شافع يوم القيامه»

(Quranı öyrənin. Çünki Quran qiyamət günündə şəfaətçidir_”.(٣_“

:D. Əmirəl-möminin Əli (ə) - dan nəql olmuşdur

«واعلموا انه شافع مشفع وقائل مصدق وانه من شفع له القرآن يوم القيامه شفع فيه»

Bilin ki, Quran şəfaəti qəbul olunan şəfaətçidir və təsdiq olunan danışandır və hər_“ (kəs üçün Quran şəfaət etsə, onun şəfaəti də başqaları üçün qəbul olunar_”.(٤

Buna əsasən, Quranın şəfaəti bu cürdür: kim bu dünyada ona itaət etsə, ona əməl etsə, onu özünə rəhbər və hidayətçi etsə, bu əlaqə və bağlılıq o dünyada xarici və zahiri formaya düşəcək və Quran onu behiştə, mənəvi təkamül və İlahi nemətlərə tərəf hidayət edəcək. Quranın onun əleyhinə danışması da, onun bu dünyada Qurani - Kərimdən itaətsizliyinin təcəssümüdür. Bu da insanın axirət dünyasında cəhənnəmə .getməsinə səbəb olacaq

Şəfaətin, rəhbərin şəfaəti məsələsidə, o biri dünyada, öz ardındakı bir dəstəyə rəhbərlik edən, özü başqa bir



---

.Ən`am”, ٥١“ .[١]-١

.Məcməul bəyan”, c. ۴, s ٣٠۴ - ٣٠۵“ .[٢]-٢

rəhbərin aradıcılı və başqa bir imamın itaətçisi olsun. Ona görə də əziz Peyğəmbər (s) kimi bir şəxs, bütün məsum imamlar (ə) - ın və digər haqq rəhbərlərinin, rəhbəri olacaq. Çünki o bu dünyada hamının rəhbəri və bütün imamların imamıdır. Əlbəttə imamlardan və rəhbərlərdən heç biri əziz Peyğəmbər (s) qədər şəfaət etməyəcəklər. .Bu barədə rəvayətlərimiz var ki, inşallah gələn bəhslərimizdə onlara işarə edəcəyik

### Tövbə.۴

Tövbə və haqqa qayıdış öz xüsusi şərtləri ilə, günahkar şəxsə əlavə olan və onun təkmilləşməsi ilə, onu haq bağışlanmasına yetişməsinə hazırlayan səbəblərdən biridir. Rəvayətlərdə də şəfaətçi kəlməsi tövbəyə deyilmişdir. Əmirəl-möminin (ə) - dan nəql :olmuşdur

«لا شفيع انجح من التوبه، لا شفيع انجح من الاستغنا لا شافع انجح من الاعتذار»

Heç bir şəfaətçi, Allah dərgahında tövbədən_,(۱) _istiğfardan_(۲) _və üzr_“ (gətirməkdən çox nicat verən deyil_”.(۳

:Tövbənin hər bir şəfaətçidən daha artıq xilaskar olmasının səbəbi

Tövbə insana bu dünyada əlavə olan şəfaətçilərdəndir. Allahın verdiyi vədəyə . ۱ :əsasən, İlahi bağışlanma tövbə edənlərə şamil olur

{وَإِنِّى لَغَفَّارٌ لِّمَنْ تَابَ وَآمَنَ وَعَمِلَ صَالِحًا}

Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni yaxşı işlər görüb, sonra da doğru_“ (yolu tutanı çox bağışlayanam__!_”.(۴



---

.Vəsailuş – şiə, c.۱۱, s ۲۶۵ . [۱] -۱

.Qürərul-hikəm, c. ۲, s ۸۴ . [۲] -۲

.Həmin . [۳] -۳

.Taha”, ۸۲“ . [۴] -۴

Tövbə hamıya şamil olan və ümumi bir şəfaətdir və bütün günahlarda, hətta küfr və .۲ şirkdə də təsirlidir. Bu mənada ki, əgər müşrik və kafir də tövbə edib, Allaha tərəf qayıtsa və islama iman gətirsə, əlbəttə Allahın bağışlamasına şamil olacaq. Amma :Qurani Kərimin buyurduğu

{إِنَّ اللّهَ لاَ يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَن يَشَاء}

Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə dilədiyi_“ (kimsə üçün bağışlar_”.(۱

Burada işarə şirk halında, küfr və şirkdən tövbə etmədən dünyadan gedən şəxsədir. Belə bir şəxs İlahi bağışlanmağa şamil olmur. Amma tövhid və islamla dünyadan .gedən şəxslərin digər günahları , hətta tövbə də etməsələr, bağışlanması mümkündür

Tövbə, onda olan şərtlərlə, günahkar şəxsdə daxili bir dəyişiklik yaradır,onun . ۳ düzəlməsinə səbəb olur və onun keçmiş günahları tövbə sayəsində silinir. Bu məsələ :barəsində Əmirəl- möminin (ə) - dan nəql olunmuşdur

«ثمره التوبه استدراک فوارط النفس»

(Tövbənin faydası, nəfsin səhvlərini silməkdir_”.(۲_“

**İlahi peyğəmbərlərin duası.۵**

Şəfaətin qisimlərindən biri, hansı ki, onun baş verməsi (tövbə kimi) bu dünyadadır, İlahi peyğəmbərlərin, mələklərin, Allah övliyalarının və möminlərin duasıdır ki, əgər .insanla yanaşı olsa, elə bu dünyada İlahi bağışlanmağa səbəb ola bilər



---

.Nisa”, ۱۱۶“ . [۱]-۱

.Müstədrəkul vəsail, c. ۱۲, bab ۸۶, s ۱۳۰ . [۲]-۲

Həzrət Yusif (ə) – ın əhvalatında görürük, Yəqubun övladları öz işlərindən peşman olan :vaxt, atalarına üz tutub, ərz edirlər

{قَالُواْ يَا أَبَانَا اسْتَغْفِرْ لَنَا ذُنُوبَنَا إِنَّا كُنَّا خَاطِئِينَ}

Oğlanları ona:) "_Ata! Bizim üçün günahlarımızın bağışlanmasını dilə. Biz, doğrudan) (da, günahkar olmuşuq!" dedilər_".(١)

:Həzrət Yəqub (ə) da cavabında buyurur

{قَالَ سَوْفَ أَسْتَغْفِرُ لَكُمْ رَبِّيَ إِنَّهُ هُوَ الْغَفُورُ الرَّحِيمُ}

Yəqub) dedi: Mən Rəbbimdən sizin bağışlanmağınızı diləyəcəyəm. O, həqiqətən,)_" (bağışlayandır, rəhm edəndir!_"(٢)

:Qurani Kərim, həmçinin islamın əziz peyğəmbəri (s) barəsində buyurur

{وَلَوْ أَنَّهُمْ إِذ ظَّلَمُواْ أَنفُسَهُمْ جَآؤُوكَ فَاسْتَغْفَرُواْ اللّهَ وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُواْ اللّهَ تَوَّابًا رَّحِيمًا}

Onlar (münafiqlər) özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan_" bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın (tövbələri qəbul edən, mərhəmətli olduğunu bilərdilər_".(٣)

:Mələklər barəsində buyurur

{وَالْمَلَئكَهُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِهِّمْ وَ يَسْتَغْفِرُونَ لِمَن فيِ الْأَرْضِ أَلَا إِنَّ اللَّهَ هُوَ الْغَفُورُ الرَّحِيم}

Mələklər də Rəbbini həmd – səna ilə təqdis edər və yerdəkilərin (günahlarının)_" (bağışlanmasını diləyərlər. Bilin ki, Allah, həqiqətən bağışlayandır, rəhm edəndir!_ ".(٤)

:Həmçinin başqa yerdə belə buyurur

{الَّذِينَ يَحْمِلُونَ الْعَرْشَ وَمَنْ حَوْلَهُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيُؤْمِنُونَ بِهِ وَيَسْتَغْفِرُونَ لِلَّذِينَ آمَنُوا رَبَّنَا وَسِعْتَ كُلَّ شَيْءٍ رَّحْمَةً وَعِلْمًا فَاغْفِرْ لِلَّذِينَ تَابُوا وَاتَّبَعُوا سَبِيلَكَ وَقِهِمْ عَذَابَ الْجَحِيمِ}

Ərşi daşıyanlar və onun ətrafında olanlar (mələklər) öz Rəbbini həmd-səna ilə təqdis_“ edir, Ona (qəlbən) inanır və mö’minlərin bağışlanmasını diləyərək belə deyirlər: "Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib Sənin (yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru!_” (١

Əlbəttə, peyğəmbərlər, övliyalar, mələklər, və möminlərin duası, şəfaətin lüğəti mənasını nəzərdə tutaraq və həmçinin onların duasının günahkar şəxslə yanaşı olub və onu günahın təsir və nəticələrindən xilas etməsini nəzərdə tutaraq, bir növ şəfaətdir, lakin şəfaətçi kəlməsinin işlənməsi nəzərindən, rəvayətlərdə elə bir yer tapmadıq ki, bu bağışlanmaq vasitəsi şəfaət kimi işlənmiş olsun. Bir halda ki, tövbə, .əməl və... kimi yerlərdə, şəfaətçi kəlməsi işlənmişdir

Şəfaətin dörd qisminin hamısı, onun baş vermə yerini və insana əlavələnməsi bu dünyada olan şəfaətdir. Bu şəfaətin ardınca, bağışlanmaq və məğfirət, bəzən bu .dünyada şəxsə nəsib olur və onun nəticə və təsiri, o dünyada da ona yetişəcəkdir

### Bağışlanmaq şəfaəti.۶

İndiyə kimi, şəfaətin qisimlərindən bəyan olunanlar, baxmayaraq ki, şəfaətin lüğəti mənasındakı həqiqi örnəklərindən idi və onların bəzisinə də rəvayət və hədislərdə, şəfaətçi və bunun kimi kəlmələr deyilmişdir. Əgər bunları şəfaətçi adlandırsaq, bu kəlməni düzgün işlətmişik, lakin onların heç biri istilahi və Quran ayələrinin



---

.Qafir”, ۷“ . [۱] -۱

nəzərində olan şəfaət deyil. İstilahi şəfaət odur ki, günahların bağışlanması, əfvi və məğfirət üçün vasitəçilik, qiyamət günündə baş versin. Şəfaətin bu qisminə çoxlu .iradlar etmişlər

Şəfaətə aid ayələr də (istər şəfaəti inkar edən ayələr və istərsə də isbat edən ayələr) şəfaətin baş vermə yerini qiyamət günü qərar veriblər. Burada bu ayələrdən bəzisinə .işarə edirik

{وَاتَّقُواْ يَوْماً لاَّ تَجْزِى نَفْسٌ عَن نَّفْسٍ شَيْئاً وَلاَ يُقْبَلُ مِنْهَا شَفَاعَةٌ}

Qorxun o gündən ki, (Allahın izni və köməyi olmayınca) heç kəs heç kəsin karına gələ_“ bilməsin (heç kəs heç kəsə öz əməlindən bir şey verə bilməsin), heç kəsdən şəfaət (bu və ya digər şəxsin günahlarının bağışlanması barəsində xahiş, iltimas) qəbul (olunmasın_”.(١)

{يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ أَنفِقُواْ مِمَّا رَزَقْنَاكُم مِّن قَبْلِ أَن يَأْتِىَ يَوْمٌ لاَّ بَيْعٌ فِيهِ وَلاَ خُلَّةٌ وَلاَ شَفَاعَةٌ}

Ey iman gətirənlər! Alış - verişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün_“ ((qiyamət günü) gəlməmişdən əvvəl, sizə verdiyimiz ruzidən paylayın!_”(٢

{يَوْمَئِذٍ لَّا تَنفَعُ الشَّفَاعَةُ إِلَّا مَنْ أَذِنَ لَهُ الرَّحْمَنُ وَرَضِىَ لَهُ قَوْلًا}

O gün Rəhmanın izin verdiyi və söz danışmağına razı olduğu kəslərdən başqa, heç_“ (kimin şəfaəti fayda verməz!_”(٣

{وَكَم مِّن مَّلَكٍ فِى السَّمَاوَاتِ لَا تُغْنِى شَفَاعَتُهُمْ شَيْئًا إِلَّا مِن بَعْدِ أَن يَأْذَنَ اللَّهُ لِمَن يَشَاءُ وَيَرْضَى}

Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq_“ Allah Öz istədiyi və razı olduğu kimsəyə (mələyə, yaxud möminə) izin verdikdən sonra _(onun



---

.Bəqərə”, ۴٨“ . [١] -١

.Həmin, ٢۵۴ . [٢] -٢

.Taha”, ١٠٩“ . [٣] -٣

(şəfaəti fayda verər)_”.(۱)_

Ayələri düşünəndə, Qurani-Kərimin nəzərində olan şəfaətin qiyamət günündə baş verəcəyi məlum olur və belə bir gündə, bir dəstə Allahın iznilə, şəfaətə layiq olan günahkarlardan bir dəstəsini şəfaət edəcəklər.

Əlbəttə, şəfaətdən faydalanmaq şəraiti bu dünyada hazırlanmalıdır və şəfaətdən faydalanmaq üçün ləyaqət, bu dünyada əldə edilməlidir.



---

۱- [۱]. “Nəcm”, ۲۶.

## ŞƏFAƏT NƏTİCƏSİNDƏ RUH VƏ NƏFSDƏN ÇİRKİNLİKLƏRİ APARMAQ

### İşarə

Şəfaətin keyfiyyət və həqiqətinin, həmçinin bəşəri şəfaətlərlə fərqlərinin aydın olması .üçün, iki müqəddimə və çox mühüm bir məsələyə izah verməliyik

#### Birinci müqəddimə: Allahın geniş rəhməti

Bütün yaranış aləmində cari olan, həm təbiət və maddə aləmində, həm qeyri maddi və ölümdən sonrakı aləmdə cari olan, yaranışın qəti qanunlarından olan, ümumi bir qayda .budur ki, Allahın rəhməti hər bir şeyi əhatə edir və hər bir şeyə qalibdir

:Kumeyl duasının əvvəlində oxuyuruq

«اللهم انی اسئلک برحمتک التی وسعت کل شیء»

."_İlahi! Hər bir şeyi əhatə edən rəhmətin vasitəsilə səndən istəyirəm_“

Quranda da Allahın rəhmətinin genişliyi, müxtəlif ayələrdə təkid olunmuşdur, o :cümlədən

{فَإِن كَذَّبُوكَ فَقُل رَّبُّكُمْ ذُو رَحْمَةٍ وَاسِعَةٍ}

_Əgər onlar səni yalançı hesab etsələr, de: "Rəbbiniz böyük_“

(mərhəmət sahibidir_".(١_

İndi bu sual qarşıya çıxır ki, Allahın rəhməti nədir? İlahi rəhmətin nişanələri hansıdır? Biz adətən "rəhmət" kəlməsini eşidəndə, ürək yanan, rəhimli və mehriban bir adam zehnimizə gəlir. Halbuki, "Allahın rəhməti genişdir və hər şeyi əhatə edir, "ya" rəhmət və elmi, hər yerdə və hər şeydə caridir" deyən vaxt, mənası mən və sizdə olan rəhmət deyil, əksinə İlahi rəhmətin genişliyində məqsəd budur ki, aləmin hamısı Allahın rəhmətinin təcəllisidir. Varlıq aləmi, istər maddə və istərsə də qeyri maddə aləmində onların hamısı, onun rəhmətinin təcəlli və təcəssümüdür. Varlıq aləminin hamısı, :Allahın rəhmətidir. Hər nə varsa onun rəhmətidir. Qurani-Kərimdə buyurur

{وَ هُوَ الَّذِی يُنَزِّلُ الْغَيْثَ مِن بَعْدِ مَا قَنَطُواْ وَ يَنشُرُ رَحْمَتَهُ}

İnsanlar) ümidsizliyə qapılandan sonra, yağmur göndərən, nemətini (yağışını) açıb)_"
(paylayan Odur_".(٢

Yağışın yağması nəticəsində, yer yaşıl, təravətli olur və özünə yeni həyat tapır. Buna əsasən, təbii və yaranış təsiri olan və yerdə yaranan həyatı, Quran rəhmət adlandırır. İndi "ğəys" (yağış) deyəndə məqsəd, istər yağışın özü olsun (hansı ki, rəhmətidir və hər yerdə yayılır) və istərsə də yağışdan yaranan nəticə olsun (hansı ki, gül və bitkinin bitməsindən və həyatdan ibarətdir.), fərq etmir. Hər halda, Quran təbii bir mövcuda, .rəhmət kəlməsini işlətmişdir

Deməli, hər bir şey, insan, varlıq sistemi və vücud aləminin hamısı, İlahi rəhmətlərdən :biridir. Allahın nemətlərinin hamısı, İlahi rəhmətlərdir

,Su, hava, işıq, qaranlıq, gündüz, gecə, günəş, ay, ulduzlar



---

.Ən`am", ١٤٧" .[١]-١
.Şura", ٢٨" .[٢]-٢

.yer, gül, bitki, bunların hamısı İlahi rəhmətin təcəllisidir

**Geniş rəhmətin təcəssümünə bir neçə nümunə**

Əgər bu aləmə və öz ətrafımızdakılara bir az diqqət etsək, faydalı, salamat və sağlam mövcudatın, faydasız və qeyri sağlam şeylərdən çox olduğunu görərik. Salamat insanlar, xəstə insanlardan min dəfələrlə çoxdur. Xəstəlik və bəla nadir olan şeylərdəndir. Varlıq və yaranış aləmində, əsas qanun budur ki, İlahi nemətlər və yaranmışlar salamat, sağlam və bəlasız olsunlar. Bunların hamısı, İlahi rəhmətin .üstinlüyü və genişliyinin təzahürüdür

Allah insanın və heyvanların bədənində, elə bir qüvvə yaradıb ki, bacardığı qədər, xəstəlikləri özü uzaqlaşdırır. Əslində, dərman o qüvvəni gücləndirir ki, xəstəliklə daha yaxşı mübarizə edə bilsin. Sınmış sümüyü bağlamaqla, ya başqa vasitələrlə, bu iki hissəyə bölünmüşü bir – birinin kənarında qoyurlar, bədən özü bir müddətdən sonra, sınığı düzəldir. Deməli, dərman bədənin qüvvəsini güclədirir ki, özü onu düzəltsin, lakin .dərman sümükləri bir – birinə birləşdirmir

Allah çirkinlikləri aradan aparmaq üçün, varlıqlar təyin etmişdir. Dənizin suyu, ağaclar və bitkilər, havanı saflaşdırırlar. Əgər havanın belə yuyulub saflaşması olmasaydı, insan heç vaxt diri qala bilməzdi; Yəni bir müddətdən sonra, hava karbon qazıyla dolardı, insan nəfəs ala bilməyib, boğulardı və sağlam havaya ehtiyacı olan varlıqların hamısı, məhv olardılar. Allah, nəfəs olmağın mümkün olmasına görə havanı daima saflaşdırmaq üçün su, bitki və ağacları təyin etmişdir. Biz bu nemətlərin hamısından ,xəbərsizik. Bu İlahi nemətlər

.bizim diqqətimiz olmadan, bizim ətrafımızdadır və öz işlərini görürlər

İnsan çoxlu ifrazat və zibil istehsal edir. Heyvanlar da belədir, ifrazatları var. Öləndən sonra da bədənləri iylənir. Bunların hamısı bu formada yerdə qalsaydı, yer kürəsində daha yaşamaq olmazdı, lakin Allah Taala, kiçik varlıqlar yaradıb, hansı ki, biz onlara mikrob, bakteriya və s... deyirik. Bunlar ifrazat və artıq şeyləri bir – birindən ayırıb, məhv etəməyə əmr olunublar. Bunlar olmasaydı, çox çəkməzdi ki, dünya zibil ilə .dolardı və diri varlıqlar heç vaxt öz həyatlarına davam edə bilməzdilər

Deməli, insan maddə və təbiət aləminin harasına baxsa; öz bədəninə, bitkilər aləminə, heyvanlar aləminə, dənizlərə, atmosferə və s. İlahi nemətləri, mehribanlığı, lütf və mərhəmətin təzahürünü görər. Allahın rəhmətinin genişliyinə və çoxluğunu etiraf edər. Əlbəttə, bəla, müsibət, sel və zəlzələ kimi hadisələr də qarşıya çıxır. Bunlar .Allahın sonsuz nemətlərinin qarşısında, sıfır və yox dərəcəsindədir

İlahinin rəhmət təzahüründən biri də, insanların nəfs və ruhudur. İnsanın fitrəti pak, Allah- pərəst və Allah axtaran, haqq və ədaləti, yaxşılıqları və üstünlükləri istəyəndir. Bu Allahın rəhmətinin təzahürüdür. Əlbəttə, yaşayış mühiti, ailə, ata, ana və s.., insanı :dəyişir, amma insanın zat və fitrəti pak və sağlam yaradılmışdır. Mübarək ayə buyurur

{فَأَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًا فِطْرَةَ اللَّهِ الَّتِى فَطَرَ النَّاسَ عَلَيْهَا}

Ya Rəsulum! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq (pak bir müvəhhid, xalis )_“ _təkAllahlı kimi) üzünü Allahın fitri

(olaraq insanlara verdiyi dinə (islama) tərəf tut”._(١)_

Yuxardakı ayəyə əsasən, insanların fitrəti din, Allahpərəstlik və tövhidə əsasən .qurulub

İlahi peyğəmbərləri göndərməyin özü, Allahın rəhmətinin təzahürlərindəndir. Allah peyğəmbərlər və kitablar göndərdi; Yəni bizə ağıl verdi, pak fitrət bağışladı və yol göstərən də göndərdi ki, doğru yolu bizə göstərsin. Bunların hamısı, İlahi rəhmətin .təzahürlərindəndir

### Bağışlamaq İlahinin geniş rəhmətinin təcəssümüdür

Bağışlanmaq və məğfirət də, axirətdə insana şamil olan, İlahinin rəhmətinin təcəlli və təzahürlərindəndir, lakin bağışlamaq və məğfirət insanın ruh və canından günahın pis təsirlərini aparmaq və yumaq mənasındadır. Çünki, günah insanda təsirlər yaradır və .həmin təsirlər, o biri dünyada əzab və cəza formasına düşəcək

Allahın bağışlaması, günahın pis təsirlərini və çirkin nəticələrini məhv edir, insanın ruhunu təbiətdə mövcud olan yuyulma kimi təmiz edir və gözəlləşdirir. Mikrob və .xəstəliyin əlamətlərini məhv edən dərman kimi

Buna əsasən, günahın bağışlanması və məğfirəti bəşər hakiminin günahkar bir şəxsə güzəşt etməsi kimi istisna olan bir şey deyil, əksinə varlıq sistemində Allahın rəhmətinin çoxluğunun təzahürüdür. Ona görə də, Allahın bağışlamaq və məğfirətinin, insanlar arasında yayılan əfv və bəxşiş kimi olmasını təsəvvür etməməlisiniz. Əgər Allah günahkarın günahından keçib, onu əfv etsə və bağışlasa, bu bəşər güzəştlərindən fərq edir. Çünki bəşər



---

.Rum”, ٣٠“ .[١]-١

arasında bir şəxs günah etsə, onu tənbeh edən və cəzalandıran şəxs, onu bağışlasa, günahkar şəxsdə və onun ruhunda heç bir dəyişiklik baş vermir, yalnız “sənə güzəşt .etdim və fikrimdən daşındım” deyir

Dünyəvi cinayətlər barəsində də demək olar: Yalnız dünyəvi olan cinayət və pis işlər, insanın ruhuna təsir etmirlər; Yəni nə cinayət özü və nə də onun cəzası, heç biri insanın ruhuna təsir etmir. Amma Allaha itaətsizlik və günah edəndə, həmçinin günahın əfv və bağışlanmasında, ruhda zəncirvari dəyişikliklər və təsirlər yaranır. Günah edən insan belə deyil ki, yalnız bir əməli yerinə yetirdi və qurtardı, əksinə zina edən, yalan danışan, qeybət edən, şərab içən, bir nəfəri öldürən və başqa bir günahı .edən şəxsin, nəfs və ruhunda onun mənfi təsirləri yaranır

Allahın əmrinə qarşı çıxmaq və Allahın əmr və qadağalarına məhəl qoymamaq, insanın ruhunda pis təsir qoyur və onu İlahi dərgahdan uzaqlaşdırır. Buna görə rəvayətlərdə gəlmişdir ki, insan qiyamət günündə, nəfsinin əməllər nəticəsində yaranacağı formada məşhur olacaq. Yəni əməlin nəticəsi nəfsani halət olub, onun nəfsində hər hansısa bir surətdə yaransın və ola bilsin ki, müəyyən bir heyvan formasına düşsün və həmin .formada məşhur olsun

İnsanın nəfsindəki günah, ağ vərəqdəki ləkə və çirkinliyə bənzəyir. Rəvayətlərimizdə var ki, insanın qəlbi ağ səhifə kimidir, birinci günahı edərkən, bu səhifəyə qara bir ləkə düşür; qara ləkə, əslində günahın insan nəfsinə etdiyi təsirdir. Sonrakı günah isə daha çox təsir edir, hətta o yerə çatır ki, insanın nəfs və qəlbinin səfihəsinin hamısı, qaralıb zülmətə çevrilir. Bu Allaha

.günah və itaətsizliyin nəticəsidir

İndi əgər, İlahi bağışlanma bu şəxsə şamil olsa, bunu yalnız güzəşt hesab edib, fikrimizdən daşınmamalıyıq. Bağışlamaq Allahın geniş rəhmətinin budaqlarından və İlahi mərhəmətinin təzahürlərindən olduğuna görə, (bunu fürsət bilib) nəfsi yumaıı və .günahın pis nəticələrindən təmizləməlidir

Bağışlanmanın şərt və yollarından biri, tövbədir. Peşman olan, ağlayan, təvəssül edən, göz- yaşı tökən və tövbə edən bir şəxsin ruhunda, dəyişiklik yaranır. Bu daxili dəyişiklik, ruh və nəfsi çirkinlikdən saflaşdırır. Ona görə də, yalnız dildə olan, qəlb və .daxillə bağlı olmayan istiğfar, rəvayətdəkilərə əsasən, məsxərə sayılır

Hər halda, İlahi məğfirət, Allahın rəhmətinin təzahürlərindən biridir və ona görə də :mübarək ayə Allah mələklərinin dilindən buyurur

{... رَبَّنَا وَسِعْتَ كُلَّ شَيْءٍ رَّحْمَةً وَعِلْمًا فَاغْفِرْ لِلَّذِينَ تَابُوا وَاتَّبَعُوا سَبِيلَكَ وَقِهِمْ عَذَابَ الْجَحِيمِ}

Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib Sənin_“ (yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru!_”(١

Bu ayədə “fəğfir” kəlməsindəki “fa” təfri fasıdır: yəni sənin rəhmətin geniş və əhatəli olduğu üçün, tövbə edənləri və öz yolunu gedənləri bağışla və öz rəhmətini onların .halına da şamil et

Allahın məğfirət və geniş rəhməti elədir ki, günah və Allahın müqəddəs nahiyəsindən uzaqlaşma səbəbilə, zülmətdə qaranlıqlaşan, qaranlıq və qəsavətli nəfsləri, saflaşdırır. Necə ki, təbiətdə bitkilər, ağaclar, dəniz suları



---

.Qafir”, ٧“ . [١] -١

çirkli və boğucu qazlardan havanı təmizləyir və saflaşdırırlar. Həmçinin Allaha məxsus varlıqları, yer və dənizdəki və s... varlıqların ifrazatını məhv edib, ya istifadə etməyi, təbiəti təmizləməyi onlara əmr edib və tapşırmışdır. İnsanın ruh və nəfsi də, günah nəticəsində qaranlıq və çirkinlik tapanda, Allahın bağışlanması ilə yuyulub, .təmizlənməlidir

Ona görə də namaz barəsində bəzi rəvayətlərdə buyurulub: "Hər gün beş dəfə namaz qılan bir şəxs, evinin qarşısından keçən arxda, hər gün beş dəfə özünü yuyan şəxs ."kimidir

:Başqa bir rəvayətdə buyurur

Hər gün beş dəfə yuyunan şəxsin bədənində çirkinlik qalarmı? Qətiyyən yox, hər gün" ."beş dəfə namaz qılmaq, ruhu beş dəfə yumaqdır

Bağışlanmaq vasitələri; tövbə, namaz, yaxşı əməllər və digər vasitələr kimi, bunların hamısı ruhu qaranlıqlardan təmizləyən vasitələrdir, beləliklə İlahi bağışlanma, insanın .halına şamil olur

Deməli birinci müqəddimə bu idi ki, ilahi rəhmət qalibdir , hər şeyi və hər yeri əhatə .etmişdir. Allahın rəhmətinin təzahür və təcəssümlərindən biri, İlahi bağışlamaqdır

**İkinci müqəddimə: Səbəblər aləmi**

Bu dünyada İlahi rəhmətin xüsusi səbəb, hesab, kitab və sistemi olduğu kimi, bağışlanmanın bəndələrə şamil olmasının da, özünə məxsus səbəb və xüsusi sistemi varıdır. Heç bir şey səbəbsiz olmadığı kimi, Allahın rəhmətinin də hər bir yerdə xüsusi səbəbləri vardır. Allah havanı

saflaşdırır, bunun səbəbini dəniz suları, ağaclar və bitkilər və s... qərar vermişdir. Filan xəstəliyi aradan qaldırmaq istəsə, onun səbəbini xüsusi bir dərman, ya yemək, yaxud da bitkidə qərar vermişdir. İnsanın bədəninin mikrob, bəla və zəhərlərlə mübarizə .edib, davam gətirməsi üçün, bədəndə bəzi qüvvələr qərar vermişdir

Bu qanun, bəşərin hidayəti barəsində də caridir. Allah bəşəri hidayət etmək istəsə, (hansı ki, hidayət də Allahın rəhmətinin təzahürlərindən biridir) bu hidayətin xüsusi nəzm və sistemi varıdır., Allah vasitəsiz bir şəxsə vəhy etməz, əksinə bəzi şəxsləri rəsul və peyğəmbər kimi müəyyənləşdirib. Onlar da bir-birlərindən fərqlənirlər. Peyğəmbərlər (ə) – ın möcüzələri var. Bu möcüzələr də fərqlidirlər. Deməli, İlahi rəhmətin təcəssüm və təzahürlərindən olan camaatın hidayəti də, xüsusi səbəbə və .məxsus bir nəzm və hesaba malikdir

### Bağışlamaq səbəbləri

Bəndələrə bağışlanmanın şamil olmasının da, xüsusi səbəb və sistemləri var. Bağışlanmaq səbəblərindən biri, tövbədir. Tövbə ümumi bir işdir. Hər kəs tövbə etsə, hətta müşrik öz şirkindən tövbə etsə, Allah onu bağışlayar. Necə ki, Qurani- Kərimdə :buyurur

{وَإِنِّی لَغَفَّارٌ لِّمَنْ تَابَ وَآمَنَ وَعَمِلَ صَالِحًا...}

Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni yaxşı işlər görüb, sonra da doğru_“ (yolu tutanı çox bağışlayanam!_”(١

Bağışlamanın səbəblərindən o birisi, saleh əməldir. Layiqli, yaxşı iş, İlahi təklif və vəzi- - fələri yerinə yetirmək, bağışlanmaq üçün səbəbdir. Allah Taala Quran



---

.Taha”, ٨٢“ . [١] -١

:kərimdə buyurur

{الْحَسَنَاتِ يُذْهِبْنَ السَّيِّئَاتِ}

Həqiqətən, (beş vaxt namaz kimi) yaxşı əməllər pis işləri (kiçik günahları) yuyub_“ (aparar_”.(١)

Günah” məxsus bir zamanda yerinə yetirilib və tamam olub. İndi günahdan bir şey“ qalmayıb ki, yaxşı iş onu aradan apara. Deməli, “günah”ın özü qalmayıb, lakin onun təsiri ruhda qalıbdır. İnsanın nəfsində, günahın yaratdığı qaranlıq və zülmət hələ də .var. Yaxşı işlər həmin qaranlıq və təsirləri aradan aparır və məhv edir

Günahın silinmə səbəblərindən biri də, böyük günahları tərk etməkdir. Bəzən kiçik günah edən şəxs, tövbə etməsə də, əgər böyük günahı tərk etsə, onda kiçik günahı aradan gedəcək. Əlbəttə əgər bir şəxs kiçik günahı təkrar etsə və onu həmişə yerinə :yetirsə, bunun özü böyük günahdır. Bu barədə Qurani-Kərim buyurur

{إِن تَجْتَنِبُواْ كَبَآئِرَ مَا تُنْهَوْنَ عَنْهُ نُكَفِّرْ عَنكُمْ سَيِّئَاتِكُمْ وَنُدْخِلْكُم مُّدْخَلاً كَرِيمًا}

Əgər sizə qadağan olunmuş böyük günahlardan çəkinərsinizsə, Biz də sizin_“ qəbahətlərinizin (kiçik günahlarınızın) üstünü örtər və sizi (şərəfli bir mənzilə) (çatdırarıq_”.(٢)

.Balaca günahları örtmək, Allahın geniş rəhmət və bağışlanmasının təzahürlərindəndir

Başqa bir ayədə, “Allah Taala yaxşı iş görənlərin mükafatını, layiqincə verəcək,” bəyan :edəndən sonra buyurur

{الَّذِينَ يَجْتَنِبُونَ كَبائِرَ الْإِثْمِ وَالْفَوَاحِشَ إِلَّا اللَّمَمَ إِنَّ رَبَّكَ وَاسِعُ الْمَغْفِرَهِ...}

O yaxşılıq edənlər ki) kiçik günahlar (xətalar) istisna olmaqla, böyük günahlardan və)“_ _(rəzil işlərdən (zinadan) çəkinərlər. Həqiqətən, sənin Rəbbin çox bağışlayandır”.(٣)



---

.Hud”, ١١٤“ . [١] -١

Bağışlanmaq səbəblərindən o birisi, şəfaətdir. Yəni günahı olub, dünyada tövbə və istiğfar etməyən, günahlarını silmək üçün o qədər də yaxşı əməli olmayan və bunun nəticəsində, günahlarından bir miqdarını özü ilə o biri dünyaya aparan şəxs üçün, Allahın geniş rəhməti lazım bilinir ki, yenə də bir yol və şərtlərlə, bağışlanmağa şamil ola bilsin. O yol budur: İlahi məğfirət kamil nəfslər, Peyğəmbərlər və övliyalar (ə) vasitəsilə, ona şamil olsun. Əlbəttə, belə bağışlanmanın şamil olmasının da xüsusi şərt, .hesab və sistemi var

### Bağışlanmanın şamil olmasında, şəfaətin rolu

Şəfaət vasitəsilə məğfirət və rəhmətin şamil olmasının mənası budur ki, tövbə edərkən və həmçinin yaxşı işlər görərkən, dəyişiklik baş verib, günahların və pis əməllərin təsirlərinin silinməsi kimi, şəfaətdə də Peyğəmbərlər və övliyaların (ə) kamil nəfsləri vasitəsilə, günahların pis təsirləri, günahkar şəxsin nəfsindən silinir. Rəvayətlərin bəzilərində belə ibarələr gəlib: Peyğəmbər (s) bəzi şəxsləri kövsər .hovuzunda yuyunduracaq. Bəlkə də bu, həmin məsələyə işarədir

Əlbəttə, bu günahların necə aradan getməsini və günahın insandan silinməsində hansı hadisənin baş verməsini biz bilmirik. Bizə bu qədər məlumdur ki, tövbə, istğfar və s... nəticəsində bu dünyada dəyişiklik baş verdiyi kimi, axirətdə də şəfaətçilər yalnız, Allahdan: İlahi! Bu şəxsə əzab etmə, istəməyəcəklər. Çünki Allah əzab etməsə də, nəfs və ruhu həmin halda və çirkinlikdə qalıb, təmizlənməyən şəxs behiştə necə daxil ola ?bilər

Şəfaətin şərtlərinin hamısı, o cümlədən, şəxsin şəfaətə

layiqliyi və qabiliyyəti olarsa, şəfaət edən onun nəfsində dəyişiklik yaradar, onun ruh və nəfsinin çirkinlik və zülmətini “İlahi kömək” və “vilayi təsərrüf”lə təmizləyər. .(Köynəyi yuyan kimi, o təmizlənər və saflaşar) Beləliklə, İlahi məğfirət ona şamil olar

Buna əsasən, qabiliyyət mühüm bir şeydir. İlahi məğfirət baxmayaraq ki, geniş və ümumidir, lakin qiyamətdə, təmizlənmək və saflaşmağa qabiliyyəti olan şəxsə şamil olacaq. Bu dünyada da belədir, Allahın rəhməti ümumidir, yağış da İlahi rəhmətdir, lakin bəzi yerlərin qabiliyyəti var və yağış nəticəsində, gül və bitki bitirir. Bəzi yerlərin .də bu cür qabiliyyəti yoxdur, məsələn, zibilliyə yağış yağarkən, əksinə, pis iylər çoxalır

.Yağışın təbiətinin lətifliyində şübhə yoxdur. Lakin bağda lalə bitər, şoranlıqda tikan

Yəni İlahi rəhmət geniş və ümumidir, lakin bu yerin çıxarı yoxdur. Qiyamətdə də İlahi məğfirət hamıya şamil ola bilər, amma insanlarda qabiliyyət də lazımdır. Bəzi .insanların ləyaqəti var, bəzilərinin isə yoxdur

Hər halda, bütün şərtlər cəm olarsa, Allahın ümumi vilayət məqamına malik olan kamil .insanların vilayi təsərrüfləri, bu insanın nəfsinin səhifəsini yuyarlar

Əlbəttə, kamil nəfslər vasitədirlər, feyz Allahdan yetişir, bu dünyada Allah öz rəhmətini vəsilələr və vasitələrlə yetirdiyi kimi, məsələn məxsus varlıqlar vasitəsilə yer və havanı saflaşdırır, orada da bu kamil nəfslər vasitəsilə, qabiliyyəti olan çirkin nəfsi yuyar və .təmiz edər

Şəfaətin forması belədir ki, Allahın bağışlanması və rəhmətinin layiqli və qabiliyyətli şəxslərə şamil olmasını nəzərə alaraq, şəfaətçi vilayət əməlləri ilə şəfaətə ləyaqəti

olan bir şəxsin nəfsində dəyişiklik yaradır və günah nəticəsində onda yaranan qaranlıq .və çirkləri aradan aparır və nəfsi yuyur

İnsan günah edərkən, özü də nəfsində yaranan qaranlığı hiss edir, hansı ki, bu özü İlahi nemətlərdəndir. Bunu hiss etməsə, tövbə fikrinə düşməz. Səhv və günah edən insan görsə ki, neçə müddətdir tövbə etmir, dua oxumur, ağlamır, heç bir moizə məclisində olmayıb, Quran oxumayıb, dünya, maaddiyyat, dünyanın bər–bəzəyi, qadın, uşaq, pul və vəzifəyə neçə müddətdir məşğul olduğunu görsə, bu məsələlərə diqqət etsə, özündə qaranlıq hiss edər və dua məclisində oturanda, Kumeyl və İftitah duasını ləzzətlə oxuyar. Mübarək Ramazan ayının səhərlərində, heç olmasa Əbu Həmzə duasından neçə hissə oxuyar və ağlayar, nuraniyyət və qəlbinin saf olmasını hiss edər və uçmaq istəyər. Bu nəfsdə yaranan dəyişiklikdir. Ağlamaq və Allaha üz tutmaq, onu saflaşdırıb və nurlu etmişdir, necə ki, paltar yuyulandan sonra, təmiz və pak olur. Şəfaətdə də dəyişiklik baş verir, amma bu dəyişiklik, peyğəmbərlərin, övliyaların və şəfaətçilərin əli ilə və Allahın iznilə, şəfaətə layiq olan şəxslər üçün baş .verir

## HAQQ VƏ BATİL ŞƏFAƏTİN FƏRQLƏRİ

### İşarə

:Bu iki növ şəfaət arasındakı fərqi, aşağdakılarda xülasələndiririk

Doğru və həqiqi şəfaət Allahdan başlayır və günahkarda sona yetir, lakin batil .١ şəfaət; yəni bəşər cəmiyyətində yayılan və olan şəfaət, günahkardan başlayır və .hakim, ya da günahkarın cəza hökmü əlində olan şəxsdə sona çatır

Doğru şəfaətdə, Allah vəsilə və vasitəni hərəkətə gətirir və şəfaətçi onun istək və iradəsi ilə, şəfaət meydanına ayaq basır və günahkarı Allahın geniş rəhmətinə şamil edir. Əlsində həqiqi şəfaətçi, Allahın rəhmət sifətidir. Batil şəfaətdə isə, günahkar və cinayətkar, şəfaətçini həvəsləndirən və hərəkətə gətirəndir. Şəfəatçi, günahkarın onu vasitə və şəfaətə məcbur etdiyi bir vasitədir. Əslində, şəfaətçi günahkarın təsiri altında .olur

Şəfaəti Allaha məxsus bilən ayələr, bu məsələyə işarə edirlər ki, Allahın izni olmadan, :heç bir şəfaətin baş verməsi mümkün deyil, o cümlədən buyurur

{قُل لِّلَّهِ الشَّفَاعَةُ جَمِيعًا}

(De: "_Bütün şəfaət yalnız Allaha məxsusdur_".(۱)"

Bu ayə, şəfaətin bütün növlərini Allaha məxsus etmişdir. Peyğəmbərlər, imamlar, mələklər və möminlərin və s. vasitəsi ilə baş verən müxtəlif şəfaətlər. Yaranış sistemində səbəb və vasitələrin hamısı onun tərəfindən olub və Allah qarşısında heç bir müstəqillikləri olmadıqları kimi, qiyamət səhnəsində də, Allah-Taalanın rəhmət və bağışlanmasını çatdırmaqda vasitə olan kamil nəfslər, Allah tərəfindən hərəkətə gətirilər. Onun istəyi və izni olmadan, vasitə və şəfaətçi olmazlar. Günahkarın da şəfaətçi qərar verməyə gücü yoxdur. Necə ki, çoxlu ayələr bu məsələyə dəlalət edir. :Aşağıda bir neçə nümunəyə işarə edirik

{مَا لَكُم مِّن دُونِهِ مِن وَلِيٍّ وَلَا شَفِيعٍ}

(Sizin Ondan başqa heç bir haminiz və şəfaət (əzabı dəf) edəniniz yoxdur_".(۲_"

{مَن ذَا الَّذِی يَشْفَعُ عِنْدَهُ إِلاَّ بِإِذْنِهِ}

Allahın izni olmadan (qiyamətdə) Onun yanında (hüzurunda) kim şəfaət (bu və ya_" (digər şəxsin günahlarının bağışlanmasını xahiş) edə bilər?_"(۳

{يَوْمَئِذٍ لَّا تَنفَعُ الشَّفَاعَةُ إِلَّا مَنْ أَذِنَ لَهُ الرَّحْمَنُ...}

O gün Rəhmanın izin verdiyi və söz danışmağına razı olduğu kəslərdən başqa, heç_" (kimin şəfaəti fayda verməz!_"(۴

Allahın izni olmadan şəfaəti qadağan və qeyri mümkün bilən, başqa ayələr də var. Duaların bəzisində də Allahdan məsum imamları (ə) bizə şəfaətçi etməsini



---

.Zümər", ۴۴" . [۱]-۱

.Səcdə", ۴" . [۲]-۲

.Bəqərə", ۲۵۵" . [۳]-۳

.Taha", ۱۰۹" . [۴]-۴

:istəyirik, necə ki, Həzrət Rza (ə)ı ziyarət edəndən sonra oxunan duada, belə oxuyuruq

«وابلغ امتی سلامی و دعائی شفعهم فی جمیع ما سئلتک»

İlahi! Mənim salam və duamı imamlarıma yetir, və onları hacətlərimdə şəfaətçi_" (et_".(۱)

Bu iki növ şəfaət arasında olan başqa bir fərq odur ki, bəşərin adi şəfaətlərində, .۲ camaat şəfaətçinin seçimində azaddır və günahkar özü vasitə və şəfaətçini seçir, .qiyamət gününün şəfaətində isə, şəfaətçinin seçimi Allahın yanındadır

O, öz geniş rəhmətinə əsasən, günahkarlara bağışlanmanı çatdırmaq üçün, kamil .nəfslərdən şəfaətçilər seçir

Bütpərəstlər elə bilirdilər ki, özləri üçün şəfaətçilər seçə bilərlər. Ona görə də bütləri özlərinə şəfaətçi qərar verirdilər. Qurani-Kərim bu batil və puç xəyalı rədd edir və bir çox ayələrdə, açıq şəkildə buyurulurr ki, heç bir mövcudun, onun izni olmadan, şəfaət .haqqı yoxdur və şəfaətçi seçimi ona məxsusdur

Batil şəfaətlərdə, "onun yanında şəfaət olunan" (başqalarının şəfaəti onun yanında .۳ olunan şəxs); Yəni qüdrət, yaxud hökümət sahibi, şəfaətçinin təsiri altına düşür, hökm və qanunu icra etmək üçün, onun iradəsində dəyişiklik yaranır. Amma günahkar və cinayətkarda heç bir dəyişiklik baş vermir. Doğru şəfaətdə qüdrət sahibi; Yəni Allah .şəfaət edən şəxsdə təsir qoyur. Onu təsiri altına salır, şəfaətə vadar və məcbur edir

Şəfaətçi" də izah verildiyi kimi, günahkar şəxsi"



---

.Bİharül - ənvar", c. ۹۹, s ۵۷" . [۱] -۱

.dəyişir və onu günahın təsirlərindən və ruhi qaranlıqlardan saflaşdırır

Batil və səhv şəfaətlərdə hər cür günahkar və cinayətkarın, şəfaət oluna bilməsi .۴ mümkündür. Əlbəttə, bəzi şəxslər şəfaət üçün heç bir yer qoymurlar və qüdrət sahibinin nəzərində bağışlanmaz sayılırlar. Amma hər halda, batil şəfaətlər üçün xüsusi şərtlər yoxdur. Doğru şəfaətlərdə isə, belə deyil və hər bir günahkar şəfaətə .şamil olmur

Dünyəvi şəfaətlər, qanunda bir növ ayrı – seçkilikdir. Çünki qanuna, şəfaət olunan .۵ şəxsə görə, istisna formasında, göz yumulmuşdur. Amma şəfaət olunmayan şəxslər barəsində icra olunur. Axirət şəfaətlərində isə, şəfaət Allahın sonsuz rəhmətidir. Kamil nəfslər vasitəsilə, təmizlənmək və dəyişikliyə ləyaqət və qabiliyyti olan şəxslərə şamil olur. Onları cəza və əzab yerindən çıxarır. Pak olandan sonra, qətiyyən, günahın pis təsir və nəticələri onlara şamil olmayacaq. İnsanın bədənində cərrahiyyə əməliyyatı ilə, şiş yaxud çürümənin qarşısını alan bir həkim kimi. Xəstə onun pis nəticələrindən .amanda qalacaq

Axirət şəfaətinə şamil olmayan şəxslər, qanunda ayrı – seçkilik olmasına görə deyil, əksinə, onlarda Allahın rəhmət və məğfirətinə şamil olmaq üçün qabiliyyət və ləyaqət yoxdur. Günahkar onların özləridir ki, dünyada şəfaətə şamil olmaq üçün ləyaqət əldə .edə bilməyiblər

İndi "Şəfaətin həqiqəti, dünyəvi və axirət şəfaətləri arasındakı fərqlər" barəsində deyilən məsələlərə əsasən, iradlara cavab verməyə başlayırıq; əvvəlcə

.xülasə şəklində iradları, sonra isə onun cavabını verəcəyik

### Birinci irad və onun cavabı

.Birinci irad bu idi ki, şəfaətə ümid etmək, günaha cürət etməyə səbəb olur

.Bu iradı həm cavablandırmaq, həm də təhlil etmək mümkündür

:Allah Quranda öz bəndələrinə bağışlanmaq vədəsi verib və buyurub .١

{إِنَّ اللّهَ لاَ يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَن يَشَاء}

Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əvf etməz, amma istədiyi şəxsin_“ (bundan başqa olan günahlarını bağışlar_”.(١)

Bu ayə tövbə yerinə aid deyil, çünki müşrik də öz şirkindən tövbə etsə, bağışlanar. Deməli, ayənin məqsədi, Allahın öz bəndələrinə, hətta tövbə də etmədikləri halda, .vədə verdiyi bağışlanmaqdır

Şəfaətə ümidvar olmaq, günahkarın günaha cürət etməsinə səbəb olarsa, onda bağışlanmaq vədəsinin də belə bir təsir və xüsusiyyəti var. Bağışlanmaq və məğfirətə ümidvar olmaq da, şəfaətə ümidvar olmaq kimidir. Hətta tövbə və onun qəbul olunma vədəsinin, günahkarı günah etməyə cürətləndirməsi mümkündür. İnsan, günah .edəndən sonra tövbə etmək ümidi ilə, günah etməyə cürətlənəcək

:Təhlil etmək və əsas cavab budur ki, şəfaət vədəsi iki yerdə cürətə səbəb olur .٢



---

.Nisa”, ۴٨ və ١١۶ ayələr“ .[١]-١

Birinci budur: Xüsusi bir şəxsə, ya ada, məsələn alimlər, seyidlər və onun kimi adlara, qəti formada şəfaət vədəsi versələr, yaxud bir, ya bir neçə xüsusi günah barəsində, .qəti və heç bir şərtsiz şəfaət vədəsi versələr

İkinci isə budur: Bütün günahlar, həmçinin bütün əzablar, axirət mənzillərinin və qiyamət gününün əhvalatlarının hamısı barəsində, şəfaətin heç bir şərtsiz və qəti vədəsi verilmiş olsun. Amma şəfaət müxtəlif cəhətlərdən naməlum olarsa, şəfaətin hansı dəstə, hansı günahkarlar barəsində, nə vaxt, axirət mənzillərinin hansında və hansı şərtlərlə baş verməsi məlum olmasa, bütün bu naməlumluqlarla şəfaətə qəti ?vədə də verməsələr, belə olduqda günaha cürət etməyə necə səbəb olar

:Heç vaxt, heç bir kəs, şəfaətə şamil olmasına yəqin tapa bilməz, çünki

Şəfaət ayələrində bəyan olunduğu kimi, şəfaət Allahın izninə bağlıdır. Onun izni .١ olmadan heç bir şəfaətçinin şəfaət etmək qüdrəti yoxdur. Heç bir günahkar, Allahın onun üçün şəfaət etməyə izin verməsinə yəqin edə bilməz. Bu naməlumluğun özü, .yolu günahkara bağlayır və onun azadlıq hissinin və cürətinin qarşısını alır

.Şəfaətin şərtlərindən biri, şəfaət olunan şəxsdən Allahın razı olmasıdır .٢

Buna əsasən, heç bir günahkar şəfaət şərtlərinə malik olmasına, inana bilməz. Heç bir şəxs, şəfaətə inamı, öz günahının bəhanəsi qərar verib və azadcasına hər bir günaha .əl uzada bilməz

.Şəfaətin kimlər və ya hansı günahlar barəsində baş verməsi məlum deyil .٣

Şəfaətin baş vermə zamanı məlum deyil. Məhşər günü əlli min ilə bərabərdir. Bu .۴ gündə çoxlu mənzil və dayanacaqlar var. Şəfaətin hansı mərhələ və zamanda baş verəcəyi məlum deyil. İnsan o mərhələlərin hamısını və həmin çətin sıldırımları keçəndən sonramı baş verəcək? Belə olarsa, onda günahkar illərlə əzab və işkəncə görməlidir. Məhşər günü cür- bəcür əzab və işkəncələr var. Sorğu - sual və hesab - kitab elə çətindir ki, cəhənnəm əzabından heç də asan deyil. Siratdan keçmək, qiyamət gününün təhlükə və əzablarından xilas olmaq, çox çətin bir işdir. Qurani- :Kərim həmin günü belə vəsf edir

{يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ إِنَّ زَلْزَلَهَ السَّاعَهِ شَيْءٌ عَظِيمٌ، يَوْمَ تَرَوْنَهَا تَذْهَلُ كُلُّ مُرْضِعَهٍ عَمَّا أَرْضَعَتْ وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا وَتَرَى النَّاسَ سُكَارَى وَمَا هُم بِسُكَارَى وَلَكِنَّ عَذَابَ اللَّهِ شَدِيدٌ}.

Ey insanlar! Rəbbinizdən qorxun. (Allahın əzabından qorxub pis əməllərdən çəkinin,_“ yalnız Ona ibadət və itaət edin). Həqiqətən, qiyamət gününün (axır saatın) zəlzələsi dəhşətli şeydir! , Onu görəcəyiniz gün hər bir əmzikli qadın əmizdirdiyi uşağını unudar, hər bir hamilə qadın bari-həmlini (vaxtından əvvəl) yerə qoyar (uşaq salar). İnsanları (sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Ancaq Allahın əzabı çox şiddətlidir!_”(۱)

Məhşər günündən əlavə, bərzəx aləmində olduğu müddətin hamısında (nə qədər uzanacağı məlum deyil) insan öz əməllərilə çətin vəziyyətdədir. Onun çətinlik, sıxıntı və .əzabları da, qiyamət günündən az olmayacaq



---

.Həcc”, ۱ və ۲“ . [۱]-۱

Buna əsasən, bütün bu naməlumluqla, heç bir günahkar, şəfaətin ona şamil olacağına inana bilməz. Ən uzağı şəfaətə ümidi olacaq ki, ümid də insanda təsir qoyan .səbəblərdəndir

Öz gələcəyinə və özünü düzəltməyə ümidi olmayan, onsuz da cəhənnəm əzabına və oduna düçar olacağam, özlüyündə fikirləşən insan, heç vaxt özünü düzəltmək və tövbə etmək fikrinə düşməz. Çünki cəhənnəm odundan xilas olmağa ümidi yoxdur. Məşhur atalar sözünə əsasən, öz – özünə deyər: “Su ki, başdan yuxarı keçdi, istər bir .”çubuq olsun və istərsə də yüz çubuq

Özlüyündə fikirləşər ki, əgər cəhənnəmdə əbədi yanmalıyamsa, onda dünyada özümü günahın ləzzətlərindən niyə məhrum etməliyəm ki, dünyanı da özümə yandırıcı .cəhənnəm edəm

Nicat tapmağına ümidi olan şəxs, bəzi insanların onu çirkinliklərdən xilas etmələrinin mümkünlüyünü fikirləşsə, onda əməllərin pis nəticələrindən nicat tapıb, dəyişilmək və xoşbəxtliyə yetişmək, onun üçün mümkündür. Özünü düzəltməyə başlayar, həyat .prqramını dəyişər və Allaha tərəf qayıtmaq fikrinə düşər

Şəfaət, günahkarların üzünə ümid qapısının açıq olma səbəblərindən biridir, necə ki, .tövbənin də belə bir rolu var

### İkinci irad və onun cavabı

İradın xülasəsi bu idi ki, Allahın heç bir şeyin təsiri altına düşmədiyi halda, şəfaətçinin ? istəyinin təsiri altına düşməsi necə mümkündür

Bu iradın cavabı da şəfaətin həqiqətinə diqqət etməklə aydın olur. Şəfaət feyz vasitəsi və kamil nəfslər yolu ilə, günahkar şəxsə yetişən, İlahi məğfirət və rəhmət sifətidir. Deməli, şəfaət edəni, şəfaət etməyə vadar edən odur. Şəfaət ondan başlanır və günahkarda qurtarır. Nəinki günahkardan başlaya və şəfaət edən, Allahı öz təsiri .altına sala

Bu təsəvvürün mənşəyi, həqiqi və doğru şəfaəti, dünyəvi şəfaətlərlə müqayisə .etməkdir

### Üçüncü irad və onun cavabı

Bu irad da, qanunda ayrı – seçkilik idi, hansı ki, onun cavabı keçən bəhslərin əsnasında .(doğru və səhv şəfaət arasında fərq) aydın oldu

### Dördüncü irad və onun cavabı

Dördüncü irad bu idi ki, günahkar şəxs, günahına görə müəyyən bir cəza və işkəncəyə layiqdirsə, onda cəzanı ondan götürmək, bir növ zülmdür. Layiq deyilsə, cəzanı götürmək zülm deyil və ədalətə uyğundur. Deməli, bu cəza və işkəncələrin qoyulmasında əsas, zülm olmalıdır. Buna əsasən, ya cəzanı qoymaq zülmdür, ya da cəzanı götürmək, bunlardan biri zülümdür. Bunların hər ikisi Allah – taalanın zatı .barəsində qeyri mümkündür

Bu iradın cavabında (şəfaət barəsində qabaqlar dediklərimizə diqqət edərək) demək lazımdır: Halına şəfaət şamil olan günahkar şəxs, Allahın bağışlanmasından qabaqkı halında qalarsa, bunun bir növ zülm olmasını demək mümkündür. Əslində belə şəfaət, bəşəri və batil şəfaətlər kimi olacaq. Bəşər şəfaətlərində belədir. Ya

qanunun qoyulması zülmdür, ya da oğrunun türməyə salınması zülmdür. Hər halda bunlardan biri zülmdür. Başqa ibarə ilə desək, bu iş qanunu pozmaqdır və əslində cəza .qanunun əksidir

İlahi bağışlanma və şəfaətə şamil olan şəxsə bir şəxsin şəfaət etməsi məsələsində,özünün əvvəlki halında qalmır, əksinə dəyişir, pak olur və bağışlanmağa layiq olur. Allahın iradə etdiyi şeylərin hamısı, hikmət və məsləhətə əsaslanır. Əgər .günahı savaba çevirib və günahı örtürsə, hikmət və məsləhət üzündəndir

Ona görə də, böyük günahlardan qorunan şəxslərin, Allah kiçik günahlarını örtür. Çünki, günah və kişik günah edən şəxslərin ruh və nəfsində bu günah təsir qoymuşdur. Əgər bu təsir qalarsa, behiştə getməz. Ona görə də əvvəlcə pis və günah iş örtülüb, və .ya yaxşı işə çevrilməli və sonra bağışlanmalıdır

:Mübarək ayə də buyurur

{فَأُوْلَئِکَ یُبَدِّلُ اللَّهُ سَیِّئَاتِهِمْ حَسَنَاتٍ}

)Allah onların pis əməllərini yaxşı əməllərə çevirər_”.(١)_“

Buna əsasən, şəfaət və İlahi bağışlanma, qanunun əksi deyil ki, zülm və ədalətin əksi olsun, əksinə mövzunun dəyişilməsidir. Tövbədə də belədir. İnsan elə bu dünyada tövbə etməklə özünü dəyişir və günahın cəza mövzusundan çıxarıb, yaxşı iş mövzusuna daxil edir. Yaxşı əməllərin bəzisi, insanın öz vasitəsilə günahın örtülməsinə səbəb olur. Şəfaətdə də, peyğəmbərlər və övliyaların kamil nəfsləri vasitəsilə, bu dəyişiklik onda tapılır və bir mövzudan çıxıb, digər mövzuya daxil olur. Ona görə də rəhmətin genişliyi və



---

.Furqan”, ٧٠“ .[١]-١

## ŞƏFAƏTİN ŞƏRTLƏRİ

### İşarə

Ayə və məsumlar (ə) – ın rəvayətlərindən, şəfaətin hədd və hüdudunun olması, hesabsız və heç bir şərtsiz olmaması istifadə olunur. Amma şəfaətin şərtlərinin xırdalıqlarını geniş açıqlamayıblar. Bəlkə də qəsdən qısa məlumat veriblər. Çünki, bir tərəfdən şəfaət şərtləri olanlar, günahlarının bağışlanıb və şəfaətə şamil olacaqlarını bilsələr, özlərini azad görəcəklər, bu da onların günaha cürət etmələrinə səbəb olacaq. Digər tərəfdən, özlərini şəfaətə şamil görməyənlər, Allahın rəhmətindən məyus .olacaqlar. İlahi rəhmətdən məyus olmağın özü, insanın ən pis halətlərindəndir

Bu qaranlıq və qısa məlumat, insanın həmişə qorxu və ümid arasında qalmasına və öz .əməllərinə diqqət etməsinə səbəb olur

### Şəfaətin şərtləri ağıl baxımından

Ayə və rəvayətlərdən əlavə, ağıl deyir: Allahın zat və sifətləri sonsuz olduğuna görə, .Allahın bağışlama və rəhməti də genişdir və heç bir məhdudiyyəti yoxdur

Qeyri məhdud, geniş rəhmət, bütün məxluqatın halına şamil olur. Bundan əlavə, qabiliyyətin olmasını da ağıl başa düşür. Allahın rəhmətinin ona şamil olması üçün, insanda qabiliyyət olmalıdır. Lakin qabiliyyətin nə olması və hansı işlərdə baş verməsini, ağıl anlamır. Bəşər şəfaətlərində, hətta batil şəfaətlərdə də belədir. Yəni mümkün deyil, səlahiyyəti olmayan bir şəxs vasitəçi ola və şəfaət edə. Məsələn, imza etməyi bacarmayan, savadsız bir şəxsi, mühüm bir vəzifəyə, nazir, müavin və ya müdir qoyalar. Çünki belə bir şəxsin, onun üçün şəfaət etmələrinə və bu şəxsi filan .vəzifəyə qoyun deməlrinə, heç bir qabiliyyəti yoxdur

Yaxud, fərz edin bir nəfər padşaha qarşı çıxır, ona müxalifdir və onunla müharibə vəziyyətindədir. O şəxsi həmin vəziyyətdə bağışlamaları üçün heç bir kəsin şəfaət etməsi mümkün deyil. Çünki belə bir şəxsin şəfaətə qabiliyyəti yoxdur. Deməli, .ləyaqətin olması ağıl baxımından, bəşər şəfaətlərində belə, qəti və vacibi bir əsasdır

İndi qarşıya belə bir sual çıxır: qabiliyyət nədir? Şəfaət üçün onun nə qədəri lazımdır? Bu məsələyə bəzi ayə və rəvayətlərdə işarə olunub. Qısaca aydın olur ki, insanda hansı vəziyyət və sifətlər qabiliyyəti əldən verməyə, şəfaət və İlahi bağışlanmadan məhrum olmağa səbəb olur və hansı şeylər şəfaətə şamil olmaq üçün lazımdır. İndi :şəfaətin şərt və səbəblərinin bəzisinə işarə edirik

### İman .۱

Şəfaət üçün qeyd olunan ən birinci şərt imandır. Buna əsasən, küfrün bütün qisimləri, -şəfaətə mane olur. Allah

Taalanın zatını inkar etmək (şirk), peyğəmbərliyi inkar etmək, məad və cəza gününü inkar etmək, küfrə səbəb olan üç əsas məsələdir. Küfrə qayıdan hər bir şey, şəfaət və bağışlanma qabiliyyətinin insandan səlb olmasına səbəb olur.

Deməli, insan və Allah arasında əlaqə olmalı və insanın qəlbindən qeyb aləminə bir yol olmalıdır. İnsanın qəlb yolunun qeyb aləminə açıq olması, özü imandır. Əlbəttə, imanın dərəcələri fərq edir: Bəzən bir şəxsin ürəyində, yalnız qeyb aləminə balaca bir yol var. Bəzən isə bu yol bir qədər genişdir, ona görə də onun imanı daha güclü, etiqad və yəqin dərəcəsi bir az yuxarıdır. Bəzən də insanın ürəyi qeyb aləminə tam açıqdır və yəqin mərhələsinə yetişmişdir. Əmirəl – möminin Əli (ə) kimi. O, buyurur:

«لو كشف الغطاء ما ازددت يقينا»

“Əgər qeyb pərdələri kənara gedib, hər şey aşkar olsa da, mənim yəqinimə heç bir_ şey artmaz_”.(١)

Əlbəttə, bu mərhələ Allah övliyalarına, mövla Əmirəl - möminin, Allahın Rəsulu və onların pak övladlarına aiddir. Bəzi şəxslər də, onlardan sonrakı mərhələ və dərəcələrdədirlər ki, onların dərəcə və rütbələri fərqlidir. Həmçinin imanın zəif cəhətində də, müxtəlif dərəcələr var/ Sonda elə bir dərəcəyə çatır ki, ürək və qəlb qıfıllanır. Ondan qeyb aləminə heç bir yol açıq qalmır, ürək zülmət və qaranlıq olur. Belə bir şəxsin, kamil nəfslər və peyğəmbərlər vasitəsilə yerinə yetirilən şəfaətə və İlahi bağışlanmanı əldə etməyə qabiliyyətinin olmaması aydındır. Ağzı bağlı bir qab kimi, onu dənizə də atsalar və dənizin dibinə də getsə, yenə də bir damcı su onun



---

١- [١]. “Biharül - ənvar”, c. ۶٩, s ٢٠٩.

.daxilinə getməyəcək

Şəfaət məsələsində imanın şərt və lazım olmasına dəlalət edən ayələrin bəzisinə işarə :edirik

{إِنَّ اللّهَ لاَ يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَن يَشَاء وَمَن يُشْرِكْ بِاللّهِ فَقَدْ ضَلَّ ضَلاَلاً بَعِيدًا}

Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə dilədiyi_“ kimsə üçün bağışlar. Allaha şərik qoşan şəxs, şübhəsiz ki, (haqq yoldan) çox (azmışdır_”.(۱

Bu ayəyə əsasən, Allahın bağışlaması, müşrikə şamil olmur. Şirkin də növ və qisimləri var: Zatda şirk, əməllərdə şirk və s. Bəzən insan, bir neçə Allaha inanır, xeyir və şər Allahının olmasına etiqadı var. Bəzən rububiyyətdə şirki var və müxtəlif rəbblərə, ya Quranın təbirilə “cürbəcür rəbblər”ə etiqadlıdir. Aləmin tədbirini, müxtəlif rəbblərin əlində bilir. Bəzən də ibadətdə şirki var, (qabaqlar dediyimiz kimi) onun mənşəyi, işləri tədbir etmə və rübubiyyətdəki şirkdir. Hər halda, küfrə aid olan və küfrə məhkum olan .şirklərin qisimlərinin hamısı, insandan qabiliyyətin səlb olmasına səbəb olur

Bəzən də insanlar, yalnız maddi vəsilə və səbəblərə diqqət edirlər, səbəblərin səbəbinə isə diqqət etmirlər. Əlbəttə, bunlar yalnız əməldə şirkə düçardırlar. Ruzi və dolanışıqlarını rəis və müdirlərinin əlində bilirlər. Belə bir şəxs qəflət etdiyinə görə, öz rəisini əmələn ruzi verən sayır. Amma onun etiqadından soruşsanız, həmçinin onunla .bəhs etsəniz, həqiqi ruzi verəni tez tanıyacaq və öz səhvini anlayacaqdır

.Deməli, bəzən insan qəfləti nəticəsində, gizli şirkin bir mərhələsinə düçar olur



---

.Nisa”, ۱۱۶“ .[۱]-۱

Gizli şirk küfrə, İlahi bağışlanma və şəfaətdən məhrum olmağa səbəb olmur, .baxmayaraq ki, ona şirk deyilir

{يَوْمَ نَحْشُرُ الْمُتَّقِينَ إِلَى الرَّحْمَنِ وَفْدًا، وَنَسُوقُ الْمُجْرِمِينَ إِلَى جَهَنَّمَ وِرْدًا، لَا يَمْلِكُونَ الشَّفَاعَةَ إِلَّا مَنِ اتَّخَذَ عِندَ الرَّحْمَنِ عَهْدًا}.

O gün (qiyamət günü) Biz müttəqiləri Rəhmanın hüzuruna möhtərəm elçilər (şahanə_" qafilələrlə gələn əziz qonaqlar) kimi cəm edərik. Günahkarları isə Cəhənnəmə susuz vəziyyətdə sürükləyib, gətirərik. Rəhmandan əhd almış kəslər istisna olmaqla, qalanları (kafirlər) şəfaət etməyə qadir olmazlar. (Yalnız iman gətirib, yaxşı işlər (görənlər qiyamət günü Rəhmanın izni ilə şəfaət etməyə layiqdirlər)_".(١)

Bu şərif ayə, günahkarları şəfaətdən məhrum sayır. Əlbəttə, günahkar ümumidir. Günahkar bəzən kafir və bəzən də mömindir. Kafir günah etdiyi kimi, mömin də bəzən günah edir. Əlbəttə, kafirlər həm usuli-din və həm də furu-dinə görə sorğu – sual və əzablanarlar. Hər halda, burada günahkar ümumidir. Gördüyünüz kimi, əvvəlcə buyurur: Günahkarlara şəfaət olunmaz, sonra bir dəstəni istisna edir: Rəhman Allahın yanında əhdləri olan şəxslər", bu əhdin mənası nədir? Əhd elə imanın özüdür, çünki :Allah "Yasin" surəsində bu əhdi bəyan edib və buyurur

{أَلَمْ أَعْهَدْ إِلَيْكُمْ يَا بَنِي آدَمَ أَن لَّا تَعْبُدُوا الشَّيْطَانَ إِنَّهُ لَكُمْ عَدُوٌّ مُّبِينٌ، وَأَنْ اعْبُدُونِي هَذَا صِرَاطٌ مُّسْتَقِيمٌ}

Ey Adəm övladı! Məgər Mən sizdən əhd almadımmı ki, Şeytana ibadət etməyin, o_" sizin açıq __-__ aşkar düşməninizdir, Və (sizə buyurmadımmı ki) Mənə ibadət edin, (doğru yol budur?!_"(٢)

Mömin o şəxsdir ki, Allahla əhd və peymanı var, Allahla rabitə yaratmışdır. Sadə və avam ibarələrlə, ürəyindən Allaha və haqqa tərəf yolu var. İmansız şəxsin



---

.Məryəm", ٨۵ – ٨٧" .[١]-١

.Ya`sin", ۶٠ – ۶١" .[٢]-٢

Allahla heç bir əhd və peymanı yoxdur. Başqa ibarələrlə, Allahla əlaqəsini kəsib və əhd - peymanını ayaq altına qoymuşdur. Allah buyurur: İmanları olsa, şəfaətin onlara şamil .olması mümkündür, imansız günahkarlar isə, şəfaətdən məhrum olacaqlar

Əlbəttə, imanın olması, şəfaətə layiq olmaq üçün lazımı şərtdir. Lakin kifayət etməsi məlum deyil. Ona görə də fərz edək, imanı var, yenə də yəqinliklə iddia edə bilmərik ki, şəfaət onun halına şamil olmalıdır. Ola bilsin ki, digər şərtlər onda olmasın. Heç bir şəxs, yüz faiz şəfaət olunacağına yəqin edə bilməz, baxmayaraq, ehtimal veririk ki, .Allah istəsə, şəfaət ona da şamil olar

{وَنَادَى أَصْحَابُ النَّارِ أَصْحَابَ الْجَنَّةِ أَنْ أَفِيضُواْ عَلَيْنَا مِنَ الْمَاءِ أَوْ مِمَّا رَزَقَكُمُ اللّهُ قَالُواْ إِنَّ اللّهَ حَرَّمَهُمَا عَلَى الْكَافِرِينَ، الَّذِينَ اتَّخَذُواْ دِينَهُمْ لَهْوًا وَلَعِبًا وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا فَالْيَوْمَ نَنسَاهُمْ كَمَا نَسُواْ لِقَاءَ يَوْمِهِمْ هَذَا وَمَا كَانُواْ بِآيَاتِنَا يَجْحَدُونَ}

Cəhənnəm əhli cənnət əhlinə müraciət edib: “Üstümüzə bir az su tökün və ya Allahın_“ sizə verdiyi ruzilərdən bizə bir qədər ehsan edin!” - deyəcək. Onlar isə: “Doğrusu, Allah bunları kafirlərə haram buyurmuşdur!” - deyə cavab verəcəklər. O kəslər ki, dinlərini oyun-oyuncaq (əyləncə) etmiş və (fani) dünya həyatı onları aldatmışdı. Onlar bu günə qovuşacaqlarını unutduqları və ayələrimizi (bilə-bilə) inkar etdikləri kimi, Biz də onları (bu gün unudarıq!_ ”(١)

Bu ayələrdən sonra kafirlər və onların qiyamət günü İlahi nemətlərdən məhrum :olmaları barəsində buyurur

{وَلَقَدْ جِئْنَاهُم بِكِتَابٍ فَصَّلْنَاهُ عَلَى عِلْمٍ هُدًى وَرَحْمَةً لِّقَوْمٍ يُؤْمِنُونَ، هَلْ يَنظُرُونَ إِلاَّ تَأْوِيلَهُ يَوْمَ يَأْتِي تَأْوِيلُهُ يَقُولُ الَّذِينَ نَسُوهُ مِن قَبْلُ قَدْ جَاءَتْ رُسُلُ رَبِّنَا بِالْحَقِّ فَهَل لَّنَا مِن شُفَعَاءَ فَيَشْفَعُواْ لَنَا أَوْ نُرَدُّ فَنَعْمَلَ غَيْرَ الَّذِي كُنَّا نَعْمَلُ قَدْ خَسِرُواْ أَنفُسَهُمْ وَضَلَّ عَنْهُم مَّا كَانُواْ يَفْتَرُونَ}

Həqiqətən, Biz onlara (Məkkə müşriklərinə və kafirlərinə) elmlə müfəssəl izah_“ _etdiyimiz, inanan bir qövm üçün hidayət və



---

.Əraf”, ۵٠ – ۵١“ .[١]-١

mərhəmət olan (dini vəzifələrini öyrətmək üçün mükəmməl) bir Kitab (Qur’an)_ gətirdik. Onlar (kafirlər) ancaq aqibətimi (Kitabın xəbər verdiyi aqibətimi) gözləyirlər? Onun xəbər verdiyi aqibət (qiyamət) gəlib çatdığı gün əvvəllər onu unutmuş olanlar deyəcəklər: "Doğrudan da, Rəbbimizin elçiləri (bizə) haqqı gətirmişdilər. İndi bizdən ötrü şəfaət edəcək bir kimsə varmı? Yaxud geri (dünyaya) qaytarıla bilərikmi ki, etdiyimiz əməllərdən başqasını edək?" Onlar özlərinə ziyan etdilər. Uyduqları (bütlər (də) onlardan uzaqlaşıb qeyb oldu. _” (١)

Burada, kitab deyəndə məqsəd, peyğəmbərlərin göndərilməsi və Allah tərəfindən, peyğəmbərlər (ə) vasitəsilə bəşərə çatdırılan şəriətlərdir. Hər bir zamanda məxsus bir kitab olub, Tövrat, İncil və Quran kimi. Elə bir günki, bu kitabın qayıdış, son və həqiqəti aydın olar. Kitab və şəriəti dünyada unudanlar, özlərinə gəlib, təssüflənib, deyərlər: “Kaş bizə şəfaət edən bir şəfaətçi olaydı, ya biz dünyaya qayıdıb və yaxşı əməllər .”edərdik

Şərif ayə onların cavabında buyurur: “Xeyr! Belə bir arzu qeyri mümkündür. Bunların özləri öz nəfslərini ziyan və xəsarətə düçar etdilər”. Deməli, bu ayə də belə bir şəxslər .üçün, şəfaətçinin olmasını inkar edir

Digər ayədə, müşrik və kafirlərin öz etiraflarına əsasən, onlar üçün hər bir şəfaətçini :inkar edir

{وَبُرِّزَتِ الْجَحِيمُ لِلْغَاوِينَ، وَقِيلَ لَهُمْ أَيْنَ مَا كُنتُمْ تَعْبُدُونَ، مِن دُونِ اللَّهِ هَلْ يَنصُرُونَكُمْ أَوْ يَنتَصِرُونَ، فَكُبْكِبُوا فِيهَا هُمْ وَالْغَاوُونَ، وَجُنُودُ إِبْلِيسَ أَجْمَعُونَ، قَالُوا وَهُمْ فِيهَا يَخْتَصِمُونَ، تَاللَّهِ إِن كُنَّا لَفِى ضَلَالٍ مُّبِينٍ، إِذْ نُسَوِّيكُم بِرَبِّ الْعَالَمِينَ، وَمَا أَضَلَّنَا إِلَّا الْمُجْرِمُونَ، فَمَا لَنَا مِن شَافِعِينَ، وَلَا صَدِيقٍ حَمِيمٍ}

Cəhənnəm də azğınlara göstərilər. Və onlara belə deyərlər: “İbadət etdikləriniz_“ _(bütlər) haradadır? Allahdan başqa (ibadət



---

.Həmin, ٥٢ – ٥٣ . [١] -١

etdikləriniz?). Onlar sizə kömək edə bilərlərmi? Yaxud özlərinə bir kömək-ləri_ çatarmı?" Onlar (müşriklər) və azğınlar (üzüqoylu üst-üstə) oraya (Cəhənnəmə) atılarlar! İblisin bütün əsgərləri də (ora sürüklənib salınarlar). Onlar orada (öz bütləri və rəisləri ilə) çənə-boğaz olub deyərlər: Allaha and olsun ki, biz (haqq yoldan) açıq-aydın azmışdıq! Çünki biz sizi (siz bütləri) aləmlərin Rəbbi ilə bərabər tuturduq. Bizi yalnız günahkarlar azdırdı. İndi artıq nə şəfaət edən kimsələrimiz, nə də bir mehriban (dostumuz var!_"(۱)

Bu ayələr də, Allahdan qeyrisinə ibadət edən şəxslərə aiddir. Cəhənnəmdə dünyada pərəstiş etdikləri yalançı Allahlarla düşmənçilik edərlər. Kafirlər orda öz şirk, küfr və səhvlərini anlayarlar, amma yenə də, günahı digərlərinin boynuna atmağa çalışarlar. Ona görə də deyərlər: "Günahkarlar bizi düz yoldan azdırdılar. Sonda etiraf edərlər ki, bizim burada, əzabdan xilas etmək üçün, nə mehriban bir dostumuz və nə də ."şəfaətçimiz var

{وَكُنَّا نُكَذِّبُ بِيَوْمِ الدِّينِ، حَتَّى أَتَانَا الْيَقِينُ، فَمَا تَنفَعُهُمْ شَفَاعَةُ الشَّافِعِينَ}

Haqq-hesab gününü yalan sayardıq. Ölüm bizi haqlayana qədər (bu vəziyyətdə_" (qaldıq)". Şəfaət edənlərin şəfaəti onlara fayda verməz!_ "(۲)

Bu ayələrdə, kafirlər möminlərin cavabında, öz vəziyyətlərini və cəhənnəm oduna daxil olma səbəblərini bəyan edirlər. Həmin səbəblərdən olan, onların bu sözüdür: "Biz ."qiyamət gününü, bizim üçün yəqin yaranana kimi, inkar edirdiik

Bu ayədə yəqin deyəndə, məqsəd, ya ölüm və ya ölümdən sonrakı aləmdir ki, yəqinə ,səbəb olur. Əlbəttə



---

۱- [۱] . "Şuəra", ۹۱ – ۱۰۱.
۲- [۲] . "Muddəssir", ۴۶ - ۴۸.

yəqinin özünün olması da ehtimal verilir, hansı ki, o biri dünyaya daxil olmaqla hasil .olur

Hər halda, kafirlərin sözünü bəyan edəndən sonra buyurur: Şəfaət edənlərin şəfaəti, onlara heç bir fayda və mənfəət yetirməz, çünki şəfaətin onlara faydalı və təsirli .olmasına qabiliyyətləri yoxdur

Xülasə budur ki: Şəfaətin ən əsas şərti, Allahla mənəvi bağlılıq və əlaqənin olmasıdır. Şəfaət, Allah övliyalarının köməyidir, onun iznilə, Allahla öz iman əlaqələrini kəsməyən şəxslərə yetişəcək. Əgər süqut və nüzulun elə bir həddində olsa ki, onda pak bir insana çevrilmək imkanı olmasın, bu zaman kömək istəməsinin də, onun üçün heç bir təsir və .faydası olmayacaq

### Rəvayətlərə bir baxış

:İndi bu barədə bir neçə rəvayət nəql edirik

:Şeyx Səduq, ikinci İmam (ə) - dan bir rəvayət nəql etmişdir

«جاء نفر من اليهودى الى رسول الله | فساله اعلمهم عن اشياء فقال النبى | : ...و اما شفاعتى ففى اصحاب الكبائر، ما خلا اهل الشرك والظلم»

İmam Həsən Müctəba (ə) - dan uzun bir hədisdə nəql olmuşdur ki, buyurdu:_“ Yəhudilərdən bir dəstə Allah Rəsulnun (s)__ yanına gəldi. Onların ən biliklisi bir neçə məsələni Həzrətdən soruşdu. Peyğəmbər (s) onun cavabını verdi. O cümlədən buyurdu: Amma mənim şəfaətim, böyük günahları edənlərə yetişər, şirk və zülmə (düçar olanlara isə, yetişməz_”.(١

Şəfaət böyük günahlar edən şəxslər üçündür. Əlbəttə, Peyğəmbər (s) dəqiqliklə buyurmur, hansı böyük günah və kimlər üçün. Qısa şəkildə buyurur: Böyük günah ,edənlər



---

.Xisal”, ٣٥٥“ . [١] -١

amma necə və nəcür? Bu məlum deyil və qaranlıq qalıb ki, insan qorxu və ümid .arasında qalsın

Bu rəvayət iki dəstəni istisna edir: “Şirk və zülm əhlinə”. Bu iki dəstə şəfaətdən .məhrumdurlar

:Peyğəmbər (s) - dən digər rəvayət də nəql olmuşdur ki, buyurdu

«فهی (شفاعتی) نائله ان شاء الله من مات لا یشرک بالله شیئا»

Mənim şəfaətim, inşallah, o şəxsə yetişər ki, ölüm zamanı, bir zərrə qədər də Allaha_“ (şirki olmamış olsun_”.(۱

:Digər bir rəvayətdə də Allah Rəsulu (s) - dan nəql olmuşdur ki, buyurdu

«شفاعتی لمن شهد ان لا اله الا الله مخلصا یصدق قلبه لسانه ولسانه قلبه»

Mənim şəfaətim o şəxsə olar ki, ixlasla Allahın birliyinə şəhadət verər, qəlbi dilini və_“ (dili də qəlbini təsdiqləyər_”.(۲

Deməli, şirk, küfr və Allaha, peyğəmbərə (s) və qiyamət gününə imansızlıq, şəfaətin .şamil olmasına manedir və insandan qabiliyyəti alır

### Yəmin (Sağ) və Şimal (Sol) səhabələrini tanımaq

Quranın bir neçə ayəsində, yəmin (əməl dəftərləri sağ əllərinə verilənlər) və şimal (əməl dəftərləri sol əllərinə verilənlər ) əshabından bəhs olub. Şimal əshabı, şəfaətdən :məhrum olanlar kimi tanıtdırılıblar. Vaqiə surəsində belə oxuyuruq

{وَأَصْحَابُ الشِّمَالِ مَا أَصْحَابُ الشِّمَالِ، فِی سَمُومٍ وَحَمِیمٍ، وَظِلٍّ مِّن یَحْمُومٍ}

Sol tərəf sahibləri! (Əməl dəftərləri sol əllərinə verilənlər!) Kimdir, o sol tərəf_“ sahibləri? (Onlar) səmum yeli (qızmar atəş) və qaynar su içində, Qapqara duman (kölgəsində olacaqlar!_”(۳

١- [١]. Müsnəd əhməd bin Hənbəl, c. ٢, s ٤٢٦.

٢- [٢]. Həmin, ٣٠٧ və ٥١٨ səhifələr.

٣- [٣]. “Vaqiə”, ٤١ - ٤٣.

Əlbəttə, vaqiə surəsində, Məymənə və Məşəmə əshabı da zikr olub. Əshab Məymənə çox güman ki, həmin əshab yəmindir. Onlar, bərəkətli olarlar. Onların müqabilində, .Məşəmə əshabıdır , pis və mübarək olmayan şəxslər

Hər halda, “fə mən utiyə kitabəhu biyəminih” ayəsi, yəmin əshabını belə tanıtdırır ki, onlar o şəxslərdirlər ki, onların kitab və əməl dəftərlərini sağ əllərinə verərlər. Şimal .əshabının da qiyamət günü kitab və əməl dəftərlərini sol əllərinə verərlər

Müddəssir və İnşiqaq surələrində, açıqca buyurur: Əshab yəmin; Yəni əməl dəftərləri sağ əllərinə verilən şəxslər, o nların sadə və tez hesabları olacaq, heç bir gözləmələri olmaz, giriftar olmazlar, girovda olmazlar və tez xilas olarlar. Amma digərlərin hamısı, Bu ayə çox təccüblü və insanı «كل نفس بما كسبت رهينه» .öz əməllərinin girovundadırlar ayıldandır. Yəmin əshabından olsaq, nicat taparıq, əks təqdirdə, hamımız orada giriftar :olacağıq. Qurani-Məcid buyurur

{فِی جَنَّاتٍ یَتَسَاءَلُونَ، عَنِ الْمُجْرِمِینَ، مَا سَلَکَکُمْ فِی سَقَرَ، قَالُوا لَمْ نَکُ مِنَ الْمُصَلِّینَ، وَلَمْ نَکُ نُطْعِمُ الْمِسْکِینَ، وَکُنَّا نَخُوضُ مَعَ الْخَائِضِینَ، وَکُنَّا نُکَذِّبُ بِیَوْمِ الدِّینِ، حَتَّی أَتَانَا الْیَقِینُ، فَمَا تَنفَعُهُمْ شَفَاعَةُ الشَّافِعِینَ}

Onlar cənnətlərdədirlər; bir-birindən soruşacaqlar; Günahkarlar barəsində (və_“ sonra həmin günahkarlara müraciət edib belə deyəcəklər): “Sizi Səqərə (Cəhənnəmə) salan nədir?” Onlar deyəcəklər: “Biz namaz qılanlardan deyildik; Yoxsulu da yedirtməzdik; Batilə dalanlarla birlikdə biz də dalardıq; Haqq - hesab gününü yalan sayardıq. Ölüm bizi haqlayana qədər (bu vəziyyətdə qaldıq)”. Şəfaət edənlərin şəfaəti (onlara fayda verməz! _”(١)



---

.Müddəssir”, ۴٠ – ۴٨“ . [١] -١

Bu ayələrdə, behişt əhlinin cəhənnəm əhli ilə dialoqunu nəql edir və məlum olur ki, behişt əhlinin, cəhənnəm əhlindən üstünlüyü var və onlardan sual edərlər: Siz cəhənnəmə niyə düşmüsüz? Onlar cavabında, cəhənnəmə düşmələrinin səbəbini, :onların vücudunda olan dörd pis xüsusiyyətdə bilirlər

Birincisi budur ki, "Biz namaz qılanlardan deyildik". O birisi budur ki, "Kasıblara kömək və yemək vermirdik". O biri xüsusiyyət budur ki, "və kunna nəxuzu mə`əl xaizin" "xəvz" batmaq və aşağı getmək mənasındadır. Məmulən batil işlər barəsində işlənir və batildə batmaq mənasını çatdırır. Onlar etiraf edirlər ki, biz qiyamət gününü, behişt və cəhənnəmi məsxərə edən və onun barəsində məsxərə ilə danışan şəxslərlə yoldaşlıq edirdik. Yaxud dünya və dünyanın bər - bəzəyində qərq olmuşduq; dənizdə qərq olan .şəxs kimiki, nə qədər əl - qol atsa da, çölə çıxmaz

Cəhənnəm əhlində olan digər bir xüsusiyyət budur ki, deyirlər: "Biz qiyamət gününü və ."məadı inkar edərdik. Ölümümüz çatana kimi, biz bu vəziyyətdə idik

Bu ayələrdə ölüm mənasında olan "yəqin", ya buna görədir ki, ölüm yəqini bir məsələdir və onda heç bir şəkk və şübhə yoxdur, ya da buna görədir ki, öləndən sonra, insan yəqinə çatır. Dünyada bərzəx aləmi, ölümdən sonrakı aləm, məad, Allah, Peyğəmbər (s) və dünyanın digər həqiqətləri barəsində şəkk edərsə, bu dünyadan gedəndə və ruhu bədənindən çıxandan sonra, gözü açılar, həqiqətləri görər və bütün .şeylərin doğru olduğuna yəqin edər

Hər halda, onlar bu dörd pis xüsusiyyətin ölüm vaxtınacan onlarda olmasını etiraf edərlər. Bu zaman Allah buyurar: "Buna görə şəfaət edənlərin şəfaətinin, onların

."vəziyyətlərinə heç bir mənfəəti olmayacaq və şəfaət olunmayacaqlar

### Əllamə Təbatəbi və ayənin təfsiri

Mərhum Əllamə Təbatəbai şəfaət barəsində bəhs edərkən, "fimən təcri əşşəfaə?";(١) "Şəfaət kimlərə şamildir" ünvanında açıqlayıb, bu ayəni də orda bəhs ediblər. Onun nəzəri bəndənin izahlarıyla budur ki: Müddəssir surəsinin özündə olan əlamətlərə əsasən, Məkkə surələrindəndir və hicrətdən qabaq, Məkkədə nazil olub. O vaxt hələ namaz və zəkat, indiki formada olmamışdır; ona görə də, "Qalu ləm nəku minəl musəllin" ayəsindəki "səlat" kəlməsində məqsəd, islam dinində təyin olunan namaz deyil, əksinə Allaha tərəf hər növ təvazökarcasına olan ibadət və diqqətdir. Kasıblara yemək vermək dedikdə də məqsəd, Allah yolunda "ehtiyacı olanlara hər cür yaxşılıq"-.dır

Buna əsasən, şərif ayənin mənası belə olacaq ki, biz Allaha üz tutmurduq, ona ibadət etmirdik, Allah yolunda pul və yemək vermirdik. Dünya və onun bər - bəzəyində qərq olmuşduq, həmçinin cəza və hesab gününə aid ayələri məsxərə edir, ələ salırdıq və .məadı inkar edirdik

O buyurur: Günahkarlar üçün deyilən dörd xüsusiyyət və onun ardınca "fəma tənfəuhum şəfaətuş-şafein" buyurmasına diqqət etsək, onda onun müqabilində dinin dörd sütununun qərar tapdığını görərik: Allah qarşısında təvazö, Qiyamət gününə iman, kasıb və ehtiyaclılara yardım və dünyada qərq olmamaq. Ümumiyyətlə hər bir din, bunlardan təşkil olur. Allah qarşısında təvazö həm



---

.Təfsirul – mizan", c. ١, s ١۶٩" . [١] -١

qəlblə və həm də əməllədir, nəticəsi də budur ki, insan bütün vəzifələrinə əməl etsin. Allah qarşısındakı təvazö, Peyğəmbəri də qəbul etməyi əsas tutur. Çünki peyğəmbər Allah tərəfindəndir və Allah taalanın qarşısında qəlbdə və əməldə təvazö etmə, peyğəmbərliyə inam və peyğəmbərin əmrlərinə əməl etməyi, əsas tutur. Hansı ki, .dinin ən mühüm sutunu da budur

Peyğəmbərlər (ə) əsasən camaatın Allah və qiyamət gününə iman gətirmələri, sonra isə dünya yaşayışlarında öz vəzifələrini yerinə yetirmələri üçün, onları doğru və saleh əməllərə hidayət etmələri üçün gəliblər. Bu etiqadlar, insanın Allah məxluqlarına və ehtiyaclılara kömək etməsini və dünyada qərq olmamasını əsas tutur. Etiqad və əməl cəhətdən Allah qarşısında təvazökar olan insan, "nəxuzu mə`əl xaizin"ə şamil olub, dünyada qərq olmayacaq; Buna əsasən, həmin dörd pis sifətin müqabilində, dinin dörd .sütunu sayılan, dörd xüsusiyyət dayanır, hansı ki, dinin əsası həmin dörd xüsusiyyətdir

O buyurur: Bu ayələr, günahkarları və əshab yəmini bir – birinin qarşısında qoymuşdur. Bu qarşıdurmadan, günahkarlar və cəhənnəm əhlində olan dörd xüsusiyyətin, Əshab yəmində olmaması başa düşülür. Əksinə, Əshab yəmin haqq qarşısında təvazökardır. Dünyada qərq olmayıblar. Qiyamət gününə imanları var. Ehtiyaclılara kömək edirlər. .Xülasə budur ki, Allahın və camaatın haqqını yerinə yetirirlər

Sonra buyurur: Günahkarlar dörd xüsusiyyətləri ilə şəfaətdən məhrum olduqları kimi, Əshab yəmində, dörd xüsusiyyət olmayıb və onun əksi onlarda olduğuna görə, .şəfaətçilərin şəfaətinə şamil olmalarını demək lazımdır

Əməllərinin girovu olmayan, azad və behiştə daxil olan əshab yəmin, iki dəstədən ibarətdir: Bir dəstə şəfaətə ehtiyacları olmayan şəxslərdir. Digər dəstə isə, şəfaətə ehtiyacı olan şəxslərdir. O kəslər ki, heç bir böyük günah etməyiblər, və ya ediblərsə, tövbə ediblər və böyük günahları tərk etmək, onların kiçik günahlarının gizli qalmasına səbəb olub, şəfaətsiz, girovluqları gedər. Ona görə də, cənnət və nemətlərdədirlər. O biri dəstə ki, böyük günahlar edib və tövbə etməyib, şəfaətçilərin şəfaəti onlara şamil .olarsa, onlar da girovluqdan azad olarlar

Buna əsasən, O (Əllamə), məhdudiyyəti yetirən istisna və ayədəki qarşıdurmadan :istifadə edib, deyirlər

Əshabi-yəminin günahkarlarla (hansı ki, şəfaət olunmazlar) qarşıdurma hökmünə əsasən, təkcə əshab yəminin şəfaət olunacağı və onlardan qeyrisinin şəfaət olunmayacağı məlum olur. Deməli, şəfaətin şərtlərindən biri, insanın əshab yəmindən olmasıdır. Əlbəttə, O (Əllamə), digər bir bəhsin əsnasında, ayələrdən istifadə edir ki, “Əshab-yəmin”, haq və məsum imamlara itaət edən şəxslərdir. Biz bu bəhsi .açıqlayacağıq

### Bir suala cavab

Bu ayələrdə şəfaətdən məhrum olanlar üçün dörd xüsusiyyət görürük. Əgər bir şəxsdə bunların bəzisi olarsa, məsələn yalnız “ləm nəku minəl musəllin” – dən olsa, amma qiyamət gününə imanı olarsa, yaxud yalnız ”və kunnə nəxuzu mə`əl xaizin” - dən olsa və digər işləri yerinə yetirsə, bu zaman necə olar? Əgər dörd xüsusiyyətin hər biri onda olsa, şəfaətdən məhrum olma ona şamil olurmı? Həmçinin bu xüsusiyyətlərin bəzisi

?onda olsa, yenə də şəfaətdən məhrumdurmu

Əllamə Təbatəbai bu barədə buyurur: “Ma sələkəkum fisəqər” – in günahkarların hamısından soruşulması buna bənzəyir ki, siz bir zindana gedir və bir dəstəni zindanda görürsüz. Onların nə üçün zindana düşmələrini bilmək istəyirsiz. Zindana nəyə görə düşməsinin səbəbini, ayrı-ayrılıqda onlardan soruşmağınız mümkündür. Bu vaxt onların hər biri cavab verərkən, yalnız öz cinayətlərini deyər. Türməyə düşmələrinin səbəbini hamısından bir yerdə soruşsanız, bir nəfər onların hamısının adından cavab verərək, belə deyə bilər: biz şərab içmişik, oğurluq, zina etmişik, qətl törətmişik və s. Bu, o demək deyil ki, bizim hər birimiz bu cinayətlərin hamısını etmişik, əksinə bu mənadadır ki, bizim bəzimiz qətl törədib, bəzimiz şərab içib, bəzimiz zina etmişik və s. Bu şərif ayədə də sual ümumidir və cəhənnəm əhlinin hamısından soruşub. Onlar da cavab verib, deyiblər: bizim cəhənnəmə düşməyimizin səbəbi, bu dörd xüsusiyyət olub. Bu cavabın mənası budur ki, bizim bəzilərimiz namaz qılmazdı, bəzilərimiz dünyada qərq olmuşdu və s. Əgər məsələ belə olsa, onda bu cinayət və günahların hər .birinin təklikdə, insanın şəfaətdən məhrum olmasına səbəb olmasını demək lazımdır

Onun buyurduğu mənanın sübutu da var. Çünki bu ayə deyir, dünyada namaz qılmayan şəxs şəfaətdən məhrumdur. Bu məsələ məşhur bir rəvayətdə də gəlib. :İmam Sadiq (ə) şəhadət zamanı, bütün qohum və əqrəbanı ətrafına yığıb, buyurdu

«ان شفاعتنا لا تنال مستخفا بالصلاه» (۱)



---

۱- [۱] . “Bəharül ənvar”, c ۴۷, s ۲.

Bizim şəfaətimiz namazı yüngül sayana yetişməz_”. Bu rəvayət, namazı yüngül_“ .saymağı, şəfaətdən məhrum olma səbəbi kimi bildirir

(Həmçinin başqa bir rəvayətdə buyurur: “Namaz qılmayan kafirdir”.(١

Buna əsasən, ayədəki əshabi-yəmin və əshabi-şimal arasındakı qarşıdurma əlamətinə əsasən, şəfaət əshabi-yəminə məxsusdur, çünki günahkarlar şəfaətdən məhrumdurlar və onların qarşısında duranlar əshabi-yəmindir, şəfaətə şamil olan .şəxslər

### Ədalət .٢

Şəfaətin ikinci şərti budur ki, insan günahkar və zalım olmasın. Qurani-Kərim bu :barədə buyurur

{مَا لِلظَّالِمِينَ مِنْ حَمِيمٍ وَلَا شَفِيعٍ يُطَاعُ}

(O gün) zalımların nə bir dostu, nə də sözü keçən bir şəfaətçisi olar!_”(٢)_ “

Bu mübarək ayə mütləqdir. Onun zahiri mənası budur ki, bütün zalımlar şəfaətdən mərhrumdurlar. Çünki ayənin mövzusu, məxsus zülm və zalım barəsində deyil, əksinə bütün zülmlərdən, şəfaəti qadağan edibdir. Qabaqki, bəhsdə işarə olunan rəvayət də, bunun kimi ümumi idi, xüsusi zülm və ya xüsusi bir şəxsə aid edilməmişdi. İslamın əziz :Peyğəmbəri (s) - dən nəql etdik ki, buyurdu

Mənim şəfaətim şirk və zülm əhlindən (hansı ki, şəfaət onlara şamil almaz) başqa,“ .”ümməttimin böyük günahları edənlərinə yetişəcək



---

.Came əhadise şiə”, c ۴, s ٧۴“ . [١] -١

.Qafir”, ١٨“ . [٢] -٢

### Peyğəmbər(s)–in əhli–beytinin düşmənləri şəfaət olunmazlar

Bəzi rəvayətlərdə, Peyğəmbərin (s) əhli - beytinin (ə) və risalət ailəsinin düşmənlərinin şəfaətdən məhrum olmaları bəyan olmuşdur. İmam Sadiq (ə) - dan nəql olubdur ki, :buyurdu

«ولو ان الملائکه المقربین والانبیاء المرسلین شفعوا فی ناصب ما شفعوا»

Nasibi (Peyğəmbər (s) - in əhli beytinin düşməni) üçün, bütün mürsəl peyğəmbərlər_“ (və Allahın yaxın mələkləri şəfaət etsələr də, onların şəfaətləri qəbul olunmaz_”.(١)

:Həmçinin əziz Peyğəmbər (s) - dən nəql olubdur ki, buyurdu

«اذ قمت المقام المحمود تشفعت فی اصحاب اللکبائر من امتی فیشفعنی الله فیهم والله لا تشفعت فی من آذی ذریتی»

Hər vaxt mən, mahmud dərəcəsində olsam, ümmətimin böyük günahları edənlərinə_ şəfaət edərəm, Allah da mənim şəfaətimi onların barəsində qəbul edər; amma Allaha (and olsun, mənim övladlarıma əziyyət edənlərə şəfaət etməyəcəyəm_”.(٢)

Mahmud dərəcəsi, çox böyük bir dərəcədir. Adından aydın olduğu kimi, təriflənmiş və mahmuddur. Allah gecə namazı qılıb, gecə oyaq qalmalarına görə, bu dərəcəni öz .peyğəmbərinə bağışlayar

Həzrət buyurur: “Mən mahmud dərəcəsində olduğum zaman, ümmətimin günahkarlarına şəfaət edərəm; amma mənim övladlarıma əziyyət edənləri heç vaxt .”şəfaət etmərəm

Həmçinin nəql olunur, İmam Hüseyn (ə) Mədinədən çıxıb, Məkkəyə gedən zaman, :Peyğəmbər (s) - i yuxuda gördü ki, ona buyurdu



---

١- [١] . Əlməhasin, s ١٨۴.

٢- [٢] . Nurus - səqəleyn təfsiri, c. ٣, s ٢٠٧. H ٣٩٨.

«حبیبی یا حسین! کانی اراک عن قریب مرملا- بدمائک مذبوحا بارض کرب و بلاء من عصابه من امتی و انت مع ذالک عطشان لا تسقی وظمآن لا تروی وهم مع ذالک یرجون شفاعتی، لا انالهم الله شفاعتی یوم القیامه...»

Həbibim. Ey Hüseyn! Elə bil səni, tezliklə öz qanına bələnmiş və Kərbəla torpağında_“ mənim ümmətimin bir dəstəsinin əlilə, su verilmədən, susuz öldürüldüyünü görürəm. Onlar bu əməlləri ilə, yenə də mənim şəfaətimə ümidvardırlar. Allah mənim şəfaətimi (onlara qismət etməsin_”.(١)

### Şəfaət Allahın razı olduğu şəxslərə şamil olur

Şəfaətin digər şərtlərindən biri budur ki, şəfaət olunan şəxs, Allahın razı olduğu və :bəyəndiyi şəxslərdən olsun. Bu barədə Qurani- Məcid buyurur

{وَلَا يَشْفَعُونَ إِلَّا لِمَنِ ارْتَضَى}

(Onlar yalnız (Allahın) razı olduğu (izin verdiyi) kəslərdən ötrü şəfaət edə bilər_”.(٢)_“

:Bu ayədə, Allahın razılığı, iş, söz ya əməllə məhdudlaşdırılmayıb. Digər ayədə buyurur

{يَوْمَئِذٍ لَّا تَنفَعُ الشَّفَاعَةُ إِلَّا مَنْ أَذِنَ لَهُ الرَّحْمَنُ وَرَضِيَ لَهُ قَوْلًا}

O gün Rəhmanın izin verdiyi və söz danışmağına razı olduğu kəslərdən başqa, heç_“ (kimin şəfaəti fayda verməz!_”(٣)

:Həmçinin digər ayədə buyurmuşdur

{وَكَم مِّن مَّلَكٍ فِي السَّمَاوَاتِ لَا تُغْنِي شَفَاعَتُهُمْ شَيْئًا إِلَّا مِن بَعْدِ أَن يَأْذَنَ اللَّهُ لِمَن يَشَاءُ وَيَرْضَى}

Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq_“ Allah Öz istədiyi və razı olduğu kimsəyə (mələyə, yaxud möminə) izin verdikdən sonra ((onun şəfaəti fayda verər)_”.(٤)



---

١- [١] . “Biharül - ənvar”, c. ۴۴, s ٣٢٨, h ٢.

٢- [٢] . “Ənbiya”, ٢٨.

٣- [٣] . “Ta ha”, ١٠٩.

Buna əsasən, istisnada məqsəd, günahkar şəxsdir. Bu iki ayə də, Allahın günahkar .şəxsdən razı olmasını, şəfaətin şərtlərindən biri qərar veribdir

İzahı budur: Bu iki ayənin təfsirində iki nəzəriyyə var: Biri budur ki, istisna şəfaət edənə aiddir. Belə olanda, ayənin mənası budur ki, qiyamət günündə heç bir kəsin şəfaətinin faydası yoxdur və ya çətinliyi aradan qaldıran deyil, gərək Allah ona izin verib və ondan və ya onun sözündən razı ola. Bu nəzəriyyəyə əsasən, həmin ayələrdə, şəfaət .edənin şərtləri zikr olunub, nəinki günahkar şəxsə aid şərtlər

İkinci nəzəriyyə budur ki, istisnada məqsəd günahkar şəxsdir. Belə olanda, yuxarıdakı ayələrin mənası" ... və la yəşfəunə illə limənirtəza ..." ayəsilə yaxınlaşacaq və şəfaət .olunannın şərtlərini açıqlayan ayələrin sırasında olacaq

Əlbəttə, burada kimin və nə vaxt Allahın bəyəndiyi şəxslərdən olması, razılığın xırdalıqları və şərtləri dəqiq formada məlum deyil. Amma deyil deyəndə də, Allahın razılığının məsləhətsiz, hikmətsiz və hesabsız olmadığı məlumdur. Heç bir kəsdən səbəbsiz razı ya narazı olmaz. Allahın hər bir kəsdən razılığı, onun əqidə, əməl, rəftar və əxlaqına əsaslanır. Birinci dərəcədə, onun etiqadları doğru və düzgün olmalıdır. Allah bəyənən əqidə, Allahın insandan razı olmasına səbəb olur. Allah Quranda :buyurur

{وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا مِنكُمْ وَعَمِلُوا الصَّالِحَاتِ لَيَسْتَخْلِفَنَّهُم فِي الْأَرْضِ كَمَا اسْتَخْلَفَ الَّذِينَ مِن قَبْلِهِمْ وَلَيُمَكِّنَنَّ لَهُمْ دِينَهُمُ الَّذِي ارْتَضَى لَهُمْ}

Allah aranızdan iman gətirib, yaxşı işlər görənlərə - yalnız Mənə ibadət edərlər, heç_" nəyi Mənə şərik qoşmazlar deyə - onları özlərindən əvvəlkilər kimi yer üzünün varisləri _,edəcəyini və onlar üçün bəyəndiyi dini dəyişməz və möhkəm edəcəyini

(vədə veribdir_".(١_

Bu ayədən Allahın bəzi rəftar və əqidələri bəyənmədiyi və onlardan razı olmadığı aydın olur. Deməli insan, dininin Allahın razılığında olması üçün, şübhəsiz Allaha, onun sifətlərinə inanmalı, qiyamət gününə və doğru əqidələrə imanı olmalıdır. Allahın bəyənib və razılığında olması üçün, Allahın razı olduğu əqidələrə sahib olmalıdır. Ona :görə də, bu ayə barəsində olan rəvayət, belə gəlibdir

«قال: فقلت للرضا× يا بن رسول الله| فما معنى قول الله عز وجل: ...و لا يشفعون الا لمن ارتضى...؟ قال: لا يشفعون الا لمن الله دينه»

Ravi deyir: "İmam Riza (ə) - dan soruşdum: Ey Allah Rəsulnun övladı, bu ayənin_ "Şəfaət edənlər yalnız (Allahın) razı olduğu (izin verdiyi) kəslərdən ötrü şəfaət edə bilər", mənası nədir? Həzrət buyurdu: Şəfaət edənlər yalnız, Allahın dinini bəyənən (şəxs üçün şəfaət edərlər_".(٢

Buna əsasən, şəfaət birinci dərəcədə, doğru və düzgün bir dini və məzhəbi əqidəsi olan şəxslərə aiddir. Quran ayələrinə əsasən, Əshabi-yəmin bu aləmdə, haqq rəhbərlərinə itaət ediblər. Əshabi-yəmin və əshabi-şimalın xüsusiyyətlərini açıqlayan ayələrdən, belə məlum oldu ki, Allaha və qiyamət gününə kafir olan və haqq əqidələri inkar edənlər, şəfaətdən məhrumdurlar. Deməli, təkallahçı olmaq, mömin olmaq və haqq rəhbərlərinə və imamlara itaət etmək, günahkar şəxsin din və əqidəsindən .Allahın razı olmasına və şəfaətə səbəb olacaq

Digər bir rəvayət imam Sadiq (ə) - dan nəql olubdur ki, məktub formasındadır və :əslində səhabələr üçün ümumi bir göstəriş və bəyannamədir. O Həzrət yazır

«واعلموا انه ليس يغنى عنكم من الله احد من خلقه شيئا، لا ملك و لا نبى مر سل و لا



---

.Nur", ۵۵" . [١]-١

.Biharül - ənvar", c. ٨, s ٣۴" . [٢]-٢

من دون ذالک. فمن سره ان ینفعه شفاعه الشافعین عند الله، فلیطلب الی الله ان یرضی عنه»

Bilin ki, Allahın məxluqatından heç biri, nə yaxın mələklər, nə mursəl peyğəmbərlər_“ və nə də onlardan qeyrisi, sizi bir az da olsa Allahdan ehtiyacsız etməzlər. Buna görə qiyamət günü Allah yanında şəfaət edənlərin, şəfaətinin ona fayda verməsini istəyən (hər bir kəs, Allahın ondan razı olmasını istəsin_”.(۱)

İmam Sadiq (ə) bütün dostlarına elan edir və höccəti tamamlayır ki, heç bir şəxs belə fikirləşməsin ki, mənim Peyğəmbər (s) - im, ya imam Hüseyn (ə) - im var, hətta Allahım da olmasa, yenə heç bir qəmim yoxdur. Xeyr, bu bəs deyil. İmam Hüseyn (ə) -ı olmaq istəyən şəxsin, əvvəlcə Allahı olmalıdır, əks halda heç bir yaxın mələk və heç bir mursəl peyğəmbər onu Allahdan ehtiyacsız edə bilməz. Axirətdə şəfaətdən faydalanmaq istəyən hər bir şəxsin, Allahı özündən razı etməkdən başqa, heç bir çarəsi yoxdur. .Allahın razılığı bununladır ki, insanın Allah bəyənən dini olmalıdır

### Bir suala cavab

Namaz qılmayan, oruc tutmayan, vacibi hacı tərk edən, zəkat verməyən və bütün ibadət əməllərini yerinə yetirməyən şəxs, baxmayaraq ki, dildə deyir: Mən Allaha və Peyğəmbərə inanıram, amma əməldə heç bir iş görmür və özünü əqidəli bir şəxs sayır, lakin əməl və vəzifələrdən heç birini yerinə yetirmir. Allahın belə bir şəxsdən razı olduğunu demək olarmı? Belə şəxslər çoxdur. Ayənin “...illə limənirtəza...” hissəsinin belə bir şəxslərə aid olacağını demək olarmı? Əlbəttə, cavab



---

.Həmin, c. ۵۳, h ۷ . [۱] -۱

?mənfidir. Allahla heç bir rabitəsi olmayan bir şəxs, Allahın razılığında necə ola bilər

Hər bir şəxsin dinindən Allahın razılığı, təkcə doğru və düzgün əqidəsi olmasıyla deyil, əksinə əməl cəhətdən də elə olmalıdır ki, razılıq həddində olsun. Yəni deyilsin ki, Allah .bu şəxsin dinini bəyənib və ya bu şəxsdən razıdır

### Günahı təkrar etməyin nəticəsi

İlahi əmrlərdən boyun qaçırmaq, Allahın ibadət və bəndəliyini tərk etmək və günah etmək, bəzən imanı əldən verməyə səbəb olur. Allahla rabitənin olmaması və günah, Allah və Allahın övliyaları ilə rabitənin kəsilməsinə, insanın ibtidai imanını da əldən :verməsinə səbəb olur. Qurani-Kərim bu məsələni açıqca bəyan etmişdir

{ثُمَّ كَانَ عَاقِبَةَ الَّذِينَ أَسَاؤُوا السُّوأَى أَن كَذَّبُوا بِآيَاتِ اللَّهِ وَكَانُوا بِهَا يَسْتَهْزِؤُون}

Sonra da Allahın ayələrini yalan hesab edib, onları məsxərəyə qoymaqla, pislik_“ (edənlərin aqibəti lap pis oldu!_”(١)

Bu Həzrət Zeynəb (ə) - in Yezid qarşısında buyurduğu məsələdir ki, bu ayəyə istinad .etdi

Hər halda, bəzən insan günah edir, lakin peşman olub, tövbə edir. Əgər qəflət edib günah etsə, yenə də tövbə edir. Allahla rabitəsi var, namaz qılır, oruc tutur, bəzi əməlləri yerinə yetirir, amma bunların kənarında bəzi günahları da var. Lakin Allahla əlaqəsi kəsilməyibdir. Bəzən isə dünyada qərq olan şəxsdir; “... nəxuzu mə`əl xaizin”(٢) lərdəndir. Əlbəttə, Allah və qiyamətin olmasını demir, bütə pərəstiş etmir və müşrik ,...deyil, amma heç bir əməli də yoxdur; nə namaz, nə oruc, nə səcdə, nə dua



---

.Rum”, ١٠“ .[١]-١

.Muddəssir”, ۴۵“ .[٢]-٢

.nəticəsi budur ki, bu əlaqələri də əldən verir

Bu çox böyük xəbərdarlıq və təhlükədir. Heç bir kəs fəxr edib deməsin ki, mən etiqadlıyam, mən möminəm, mən Allaha pərəstiş edirəm, mənim qiyamət gününə etiqadım var, əməldə isə heç birini yerinə yetirmir, əksinə vəzifə və vaciblərini tərk .edir. Bu onun əqidəsinin zəifləməsinə və axırda da əlindən çıxmasına səbəb olur

Əlbəttə, bu əqidə ilə dünyadan getməyi bacaran şəxsin halına faydalıdır. Əgər bu əqidələr onun qəlbində və canında olmasa, onları ölümdən qabaq, ya ölən zaman əldən versə, dünyadan kafir gedəcək. İlahi itaəti yerinə yetirməmək və günah etməyin təsiri və rolu budur ki, dayanmadan əqidələri zəiflədir. Biz bilmirik ki, ölən zaman ?əqidələrimiz bizimlə olacaq, ya yox

Bəzi rəvayətlərdə gəlibdir ki, can verən zaman, şeytan insan qarşısında, su qabını təcəssüm etdirir və deyir: Mənim bu saf sudan sənə verməyimi istəsən, Allahdan və öz əqidəndən əl çəkməlisən. Son ana qədər insanın küfr və şirki etməsinə naümid deyil. (O, bütün insanları yolundan azdırmağa and içib.(١

Əgər insan günahı təkrar etsə, Allah eləməmiş, can verən zaman, şeytan ona qalib gələr. Şeytan ömür boyu, ölənəcən, şübhə yaratmaqla insanı əqidəsiz etməyə çalışır. Hər an insan öz – özündə desə: bu sözlər nədir, Allah, peyğəmbər və məad nədir? Bu an hər şey bitər. Əgər, insanda bir az da əqidə qalsa, ölüm zamanı onu da insanın əlindən alması mümkündür. Buna əsasən, insan həmişə günahdan qorxmalıdır. Mən günah edirəm, amma öləndə



---

.Sad”, ٨٢“ . [١] -١

əqidə ilə dünyadan gedib, şəfaət olaram və Allah məni bağışlayar, deməməlidir. Çünki .günah bəzən belə bir pis taleyi insan üçün yaradır

Əqidəsi doğru və düz olan, lakin əməli olmayan şəxs, Allahın razı olduğu şəxsdirmi? Əlbəttə, belə bir təsəvvür çətin, hətta qeyri mümkündür ki, bir şəxsin doğru əqidəsi olsun, Allah, qiyamət gününə, Allahın əzab və cəzasına inansın, bununla belə heç bir itaəti də olmasın. Belə bir şəxsin tapılmasını fərz edək. O, heç bir vaxt Allahın razılığında ola bilməz. Belə bir şəxs Allahı bəyənmir. Deməli, bizim həm əqidəmiz doğru olmalı və həm də əməlimiz olmalıdır. Baxmayaraq ki, insan qəflət nəticəsində, bəzən .günah edir

Sual: Günah edən və böyük günahları yerinə yetirən insan, Allahın razılığında ola ?bilərmi

Cavab: Həmin sual, İmam Sadiq (ə) və İmam Musa bin Cəfər (ə) - ın əshabından olan Məhəmməd bin Əbi Oməyr üçün də qarşıya çıxdı və onu imam Musa bin Cəfər (ə) - :dan soruşdu. Rəvayət doğru və etibarlı sənədlə bizim əlimizə yetişibdir

«عن محمد بن ابى عمير قال: "سمعت موسى بن جعفر× يقول: لا- يخلد الله فى النار الا اهل الكفر و الجحود و اهل الضلال والشرك و من اجتنب الكبائر من المؤمنين لم يسأل عن الصغائر قال الله تبارك و تعالى: {ان تجتنبوا كبائر ما تنهون عنه نكفر عنكم سيئاتكم و ندخلكم مدخلا كريما}

İbn Əbi Oməyrdən nəql olubdur ki, dedi: “İmam Musa bin Cəfər (ə) - dan eşitdim ki,_ buyurdu: Allah yalnız küfr, inkar, azğınlıq və şirk əhlini cəhənnəmdə əbədi edər. Böyük günahlardan çəkinən mömin şəxsin, kiçik günahları barəsində sorğu - sual olmaz, _çünki Allah Taala buyurur: Əgər qadağan

olunmuş böyük günahlardan çəkinsəniz, sizin günahlarınızı örtərik və sizi yaxşı yerə_
(daxil edərik_.(١)”(٢)

Rəvayətin bu hissəsində Həzrət buyurur: Küfr və şirk əhli, həmişəlik cəhənnəmdədirlər. Möminlər də əgər böyük günahlardan çəkinsələr, kiçik günahlarına görə daha soğru – sual olunmazlar. Burada İbn Əbi Oməyr üçün sual qarşıya çıxdı və :onu Həzrətdən soruşdu

«قال: فقلت له: يا بن رسول الله! فالشـفاعة لمن تجب من المذنبين؟ فقال: حدثنى ابى عن ابائه عن على× قال: سمعت رسول الله| يقول: انما شفاعتى لا هل الكبائر من امتى فاما المحسنون منهم فما عليهم من سبيل»

Deyir: O Həzrətə ərz etdim: Ey Allah Rəsulu (s) – in övladı, belə olanda, kimlərə_“ şəfaət olunar? Həzrət buyurdu: Atam öz atalarından, Əli (ə) – dan mənə rəvayət etdi ki, Allah Rəsulu (s) buyurdu: Mənim şəfaətim, ümmətimin böyük günah edənləri üçündür. Ümmətimin yaxşı iş görənləri isə, (hansı ki, böyük günah əhlindən deyildir) (onları çətinlikdə tutmaq üçün heç bir dəlil yoxdur_”.(٣)

Burada Həzrət şəfaətin kimlərə şamil olduğunu buyurur ki, onlar böyük günah :edənlərdir. Bu cavabın ardınca, İbn Əbi Oməyr, başqa bir sual soruşur

«يابن رسول الله! فكيف تكون الشـفاعة لا هل الكبائر والله تعالى يقول: ... ولا يشفعون الا لمن ارتضى وهم من خشيته مشفقون" و من يرتكب الكبائر لا يكون مرتضـى فقال: يا ابا احمد! مامن مؤمن يرتكب ذنبا الا سائه ذالكك وندم عليه وقدقال النبى|: كفى بالندم توبه وقال: من سـرته حسنته وسائته سيئته(۴) فهو مؤمن فمن لم يندم على ذنب يرتكبه فليس بمؤمن ولم تجب له الشـفاعه وكان ظالما و الله تعالى يقول: "...ماللظالمين من حميم و لا شفيع يطاع»

Ey Allah Rəsulnun (s) övladı, şəfaətin böyük günah edənlərə aid olması necə_“ _mümkündür, bir halda ki, Allah-taala



---

.Nisa”, ٣١“ .[١]-١

.Tövhidi Səduq”, s ۴٠٧, h ۶“ .[٢]-٢

Həmin. Biharül – ənvarda “Əl muznibin” – in yerinə “Əl möminin” gəlibdir. (c. ٨. S .[٣]-٣
(٣۵١

۴- [۴] . Bə`zi nüsxələrdə belədir: “ - «فهومؤمن من سرته حسنته وسائته سيئته»

buyurur: Yalnız razılıqda olan, İlahi əzabdan qorxan və narahat olan şəxslərə şəfaət_ edərlər. Ona görə də böyük günah edən, Allahın razılığında ola bilməz? Həzrət buyurdu: Ey əbu Əhməd, (İbn Əbi Oməyrin künyəsi) elə bir mömin tapılmaz ki, etdiyi günahdan narahat və peşman olmasın. Peyğəmbər (s) da buyurub: Peşmançılıq tövbədə kifayət edir. Həmçinin buyurdu:Yaxşı işi onu xoşhal edən və pis işi onu narahat edən şəxs mömindir. Etdiyi günahdan peşman və narahat olmayan şəxs mömin deyil, şəfaət ona şamil olmayacaq və zalım sayılacaq. Allah-Taala da buyurubdur: Zalımların nə can yandıran dostları və nə də şəfaəti qəbul olan (şəfaətçiləri vardır_".(١)

Rəvayətin bu hissəsində də iki cür insandan söhbət açılıbdır: Biri həssasdır, günahdan kədərlənir və yaxşı işdən xoşhal olur. O birisi isə, nəinki günah edir və ondan qorxusu yoxdur, hətta bəzən günahdan ləzzət də alır. Birinci qismə aid olan insanlar, möminlərdir. İkinci qismin insanları isə mömin deyil, əksinə zalım və şəfaətdən məhrumdurlar. Mömin insanlar fərz edək, günah da etsələr, peşman olarlar. Bu peşmançılıq onlarda imanın olduğunu göstərir. Ona görə də Allahın bəyəndiklərindən olub və şəfaət onlara şamil olar. Əlbəttə, təkcə peşmançılıq tam tövbə sayılmır. Tövbə peşmançılıqdan əlavə, qayıtmamaq qəsdi istəyir və istiğfar da etməlidir. Həzrət Əmirəl – mömin (ə)-ın hədisində, tövbə üçün altı şərt zikr olubdur.(٢) Bu şəxsdə heç olmasa, .tövbənin əsaslarından biri olan, təəssüf və peşmançılıq olmalıdır

İmam Kazim (ə) - ın sözlərinin nəticəsində, yenə də ravi üçün bir sual qabağa çıxıb və :təccüblə belə soruşub



---

.Biharül - ənvar", c.٨, c ٣۵١" . [١] -١

.Subhi Salehin Nəhcül bəlağəsi, h ۴١٧ . [٢] -٢

«فقلت له یابن رسول الله و کیف لا یکون مؤمنا من لم ینـدم علی ذنب یرتکبه؟ فقال یا ابا احمد! مامن احد یرتکب کبیره من المعاصی و هو یعلم انه سیعاقب علیها الا نـدم علی ماارتکب و متی نـدم کان تائبا مستحقا للشفعاعه و متی لم یندم علیها کان مصرا والمصر لا یغفر له لا نه غیر مؤمن بعقوبه ماارتکب ولو کان مؤمنا بالعقوبه لندم وقد قال النبی| لا کبیره مع الاستغفار ولا صغیره مع الاصرار»

Ey Allah Rəsulunun övladı, günah edib, peşman olmayan şəxs niyə mömin sayılmır?_“ Həzrət buyurdu: Ey Əba Əhməd! Böyük günah edib və ona görə tezliklə əzab və cəzalanacağını bilən hər bir kəs, etdiyi işdən peşman olacaq. Peşman olan zaman, tövbə edən sayılacaq və şəfaətə layiq olacaq. Əgər peşman olmasa (məlum olur ki) günaha təkid edir və günaha təkid edən şəxs, bağışlanmaz. Çünki belə bir şəxs günahının cəzasına iman gətirməyibdir. Cəzaya iman gətirsəydi, etdiyi günahdan peşman olardı. Əziz Peyğəmbər (s) da buyurdu: İstiğfar (və tövbə) – dən sonra, heç bir böyük günah qalmaz və günahı təkrar etməklə də, günah artıq kiçik olmayacaq (və (böyük günaha çevriləcək.)_”(١)

Diqqət etsəniz, dünyəvi işlərin sonu da belədir. Əgər insan hər hansı bir işi görür və bilir ki, bu iş onu tezliklə çox təəccüblü bir çətinliyə düçar edər, çox peşman olar və özünü danlayar. Yaxud, insan yemək yeyir və bilir ki, bu yemək onu xəstəxanaya görndərəck, yeyəndən sonra özünü danlayar ki, niyə bu işi gördüm, niyə bu yeməyi yedim. Hər halda, İnsan bilsə ki, cəzalanacaq, cəza və əzaba imanı olsa, günahından peşman olmalıdır. Əgər peşman olmasa, əzaba imanının olmaması məlum olur. Bu :məsələnin izahında Həzrət belə buyurur

«واما قول الله: "...ولا یشفعون الا لمن ارتضی..." فانهم لایشفعون الا لمن ارتضی الله دینه والدین: الا قرار بالجزاء علی الحسنات والسیئات و من ارتضی الله دینه ندم علی ما یرتکبه من الذنوب لمعرفته بعاقبته فی القیامه».

Ayədə buyrulur: Şəfaət edənlər, yalnız Allah razılığında olan şəxs üçün şəfaət_“ _edərlər; mənası budur ki: Yalnız Allah



---

.Biharül - ənvar”, c. ٨, s ٣۵٢“ . [١] -١

onun dinini bəyəndiyi şəxs üçün şəfaət edərlər. Din, yaxşı və pis işlərin mükafatına_ iman və təsdiqdən ibarətdir. Dini Allahın razılığında olan hər bir şəxs, etdiyi günahlardan narahat və peşman olar, çünki, qiyamət günündə günahlarının (aqibətindən xəbərdardır və imanı var_”.(١

Deməli, günah etdikdən sonra narahat olmayan şəxs, Allahın razı olduğu, bəyəndiyi şəxslərdən deyil. Yalnız günahından narahat və peşman olan şəxs, razılıqdadır və .şəfaətə şamil olmağa layiq olacaqır

Peşmançılıq barəsində dediklərimiz, tövbənin baş tutması üçün lazımi şərtdir. Tövbənin tam baş tutması üçün isə, peş

---

.Həmin .[١]-١

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

